

*Mən Aşığam, yüz lalı,*
*Sərraf tanır yüz lalı.*
*Namərddən kərəm olmaz,*
*Qapısında yüz lalı.*

**Sarı Aşıq**

**№3(18)**
**2015**

**Bakı-2015**

**Laçın yurdu, №3(18), 2015**
**Bakı, "Bəxtiyar-4", 2015. – 96 səh.**



Hüquqi ünvan:
**Mərdanov qardaşları 98**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

**HÖRMƏTLİ OXUCULAR!**

**“Hər kənddən, hər məktəbdən 1 abunəçimiz olsun, hər kəs 1 jurnal alsın!”** kampaniyası davam edir. Bu kampaniyaya qoşulanlara bəri başdan öz təşəkkürümüzü bildiririk.

Xatırladaq ki, jurnalımızı “Azərmətbuatyayımı”nın Sumqayıt, Gəncə, Mingəçevir, Bərdə, Ağcabədi, Yevlax, Qax və Şəki şəhərlərindəki köşklərindən və ***(050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92*** nömrələrinə zəng etməklə əldə etmək olar.

**Əziz oxucular,** jurnalımız hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır. Mətbəə xərclərinin artması səbəbindən 2016-cı ildən illik abunə qiyməti **12 manat** olacaq. İndiyədək illik abunə qiyməti **8 manat** idi.

SƏYYAR GÖRÜŞLƏR

# LAÇINLILAR QURBAN BAYRAMINI ÖN CƏBHƏDƏ ƏSGƏRLƏRLƏ BİRLİKDƏ QEYD ETDİLƏR



25 sentyabr 2015-ci il tarixdə Laçın Rayon İcra Hakimiyyətinin təşkilatçılığı ilə bir qrup rayon ictimaiyyəti nümayəndələri bayram sovqatı aparmaqla Qurban bayramını Ağcabədi rayonu ərazisindəki ön cəbhədə, təmas xəttində xidmət edən əsgərlərlə birlikdə qeyd etmişlər.

Tədbirdə Rayon İcra Hakimiyyəti başçısının birinci müavini Tofiq Mirzəyev və digər ictimaiyyət nümayəndələri çıxış edərək rayon rəhbərliyinin, eləcə də bütün laçınlıların əsgər və zabitlərə bayram təbriklərini çatdırmış, onlara möhkəm cansağlığı və xidməti vəzifələrini yerinə yetirməkdə uğurlar arzulamışlar. Çıxış edən rayon sakinləri ölkə Prezidenti, Ali Baş Komandan cənab İlham Əliyevin diqqət və qayğısı ilə formalaşmış Milli Ordumuzun tezliklə işğal altındakı torpaqlarımızın azad edilməsində son sözünü deyəcəyinə, əsgərlərimizin üç rəngli Azərbaycan bayrağını Xankəndində, Şuşada, Laçında və digər torpaqlarımızda ən yüksək zirvəyə taxacaqları zəfər bayramını birlikdə qeyd edəcəklərinə əmin olduqlarını bildirmişlər.

Tədbirin sonunda rayon nümayəndələri əsgər və zabitlərlə xatirə şəkli çəkdirmişlər.

## Laçın Rayon İcra Hakimiyyəti başçısının növbəti görüşü – səyyar qəbulu Bakı şəhərinin Xətai rayonunda keçirilmişdir

29 sentyabr 2015-ci il tarixdə Bakı şəhərinin Xətai rayonunun Naximov qəsəbəsində 75 nəfər rayon sakininin iştirakı ilə görüş – səyyar qəbulu keçirilmişdir. Görüşdə Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov dövlət başçısı tərəfindən məcburi köçkünlərə daim yüksək diqqət və qayğı göstərildiyini bir daha vurğulayaraq, ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkədə və rayonda aparılan geniş quruculuq və abadlıq işlərinin, mənzil-məişət şəraitlərinin yaxşılaşdırılması istiqamətində həyata keçirilən tədbirlərin müntəzəm olaraq davam etdirildiyini bildirmişdir.

Görüşdə dövlət başçısı tərəfindən məcburi köçkünlərə daim yüksək diqqət və qayğı göstərildiyini vurğulayan Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkədə və rayonda aparılan geniş quruculuq və abadlıq işlərindən, ayrı-ayrı sahələrdə əldə edilmiş uğurlardan, məcburi köçkünlərin problemlərinin həlli, mənzil-məişət şəraitlərinin yaxşılaşdırılması istiqamətində həyata keçirilən tədbirlərdən söz açmışdır.

Görüşdə çıxış edən məcburi köçkünlər onlara göstərilən diqqət və qayğıya görə, vətəndaşlarla yerlərdə mütəmadi görüşlərin keçirilməsi ilə bağlı ölkə başçısı cənab İlham Əliyevə öz minnətdarlıqlarını bildirmiş, ölkə rəhbərliyinin apardığı siyasət nəticəsində işğal altında olan torpaqlarımızın tezliklə işğaldan azad ediləcəyinə və tezliklə öz doğma torpaqlarımıza qayıdacaqlarına qəti əminliklərini bildirmişlər.

Görüşdən sonra keçirilmiş səyyar qəbulda 5 nəfər məcburi köçkünün müraciəti dinlənilmiş, həmin müraciətlərə baxılması üçün Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov tərəfindən yerindəcə aidiyyəti üzrə müvafiq tapşırıqlar verilmiş, tapşırıqların icrası nəzarətə götürülmüşdür.

Səyyar qəbulda Laçın Rayon İcra Hakimiyyətinin başçısının müavinləri, Rayon İcra Hakimiyyəti başçısı aparatının əməkdaşları, idarə, müəssisə və təşkilat rəhbərləri, aidiyyəti kənd inzibati ərazi dairəsi üzrə nümayəndələr iştirak etmişlər.

## Laçın Rayon İcra Hakimiyyəti başçısının növbəti görüşləri – səyyar qəbulları Bakı şəhərinin Suraxanı və Xəzər rayonlarında keçirilmişdir

30 sentyabr 2015-ci il tarixdə Bakı şəhəri Suraxanı rayonu Yeni Günəşli qəsəbəsi ərazisində müvəqqəti məskunlaşmış rayon sakinləri ilə Laçın Rayon İcra Hakimiyyəti başçısı Akif Səlimovun görüşü – səyyar qəbulu keçirilmişdir. Görüşdə 70 nəfər rayon sakini iştirak etmişdir.

Görüşdə dövlət başçısı tərəfindən məcburi köçkünlərə daim yüksək diqqət və qayğı göstərildiyini vurğulayan Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkədə və rayonda aparılan geniş quruculuq və abadlıq işlərindən, ayrı-ayrı sahələrdə əldə edilmiş uğurlardan, məcburi köçkünlərin problemlərinin həlli, mənzil-məişət şəraitlərinin yaxşılaşdırılması istiqamətində həyata keçirilən tədbirlərdən söz açmışdır.

Görüşdə çıxış edən məcburi köçkünlər onlara göstərilən diqqət və qayğıya görə, vətəndaşlarla yerlərdə mütəmadi görüşlərin keçirilməsi ilə bağlı ölkə başçısı cənab İlham Əliyevə öz minnətdarlıqlarını bildirmiş, ölkə rəhbərliyinin apardığı siyasət nəticəsində işğal altında olan torpaqlarımızın tezliklə işğaldan azad ediləcəyinə və tezliklə öz doğma torpaqlarımıza qayıdacaqlarına qəti əminliklərini bildirmişlər.

Görüşdən sonra keçirilmiş səyyar qəbulda 6 nəfər məcburi köçkünün müraciəti dinlənilmiş, həmin müraciətlərə baxılması üçün Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov tərəfindən yerindəcə aidiyyəti üzrə müvafiq tapşırıqlar verilmiş, tapşırıqların icrası nəzarətə götürülmüşdür.

Günün ikinci yarısında Bakı şəhərinin Xəzər rayonunun Mərdəkan qəsəbəsində 60 nəfər rayon sakininin iştirakı ilə görüş – səyyar qəbulu keçirilmişdir. Görüşdə Laçın Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov dövlət başçısı tərəfindən məcburi köçkünlərə daim yüksək diqqət və qayğı göstərildiyini bir daha vurğulayaraq, ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ölkədə və rayonda aparılan geniş quruculuq və abadlıq işlərinin, mənzil-məişət şəraitlərinin yaxşılaşdırılması istiqamətində həyata keçirilən tədbirlərin müntəzəm olaraq davam etdirildiyini bildirmişdir.

Görüşdən sonra keçirilmiş səyyar qəbulda 8 nəfər məcburi köçkünün müraciəti dinlənilmiş, həmin müraciətlərə baxılması üçün Rayon İcra Hakimiyyətinin başçısı Akif Səlimov tərəfindən yerindəcə aidiyyəti üzrə müvafiq tapşırıqlar verilmişdir.

Səyyar qəbullarda Laçın Rayon İcra Hakimiyyətinin başçısının müavinləri, Rayon İcra Hakimiyyəti başçısı aparatının əməkdaşları, idarə, müəssisə və təşkilat rəhbərləri, aidiyyəti kənd inzibati ərazi dairəsi üzrə nümayəndələr iştirak etmişlər.

**ARAŞDIRMA**

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN MƏDƏNİYYƏTİ



*Teatr müqəddəs yerdir; tərbiyə ocağıdır. Orada çalışanlar fədakardırlar, fədaidirlər... Teatr xadimləri tamaşaçıya bir söz demək üçün, mədəni səviyyəni yüksəltmək üçün, irəliləyişimizə mane olanlara qarşı mübarizəyə qaldırmaq üçün nə qədər çalışırlar. Heç kim bilmir ki, artist səhnəyə çıxıb rolu tamaşaçı qarşısında oynadığı vaxta kimi nə qədər həyəcan, sevinc keçirir. Mən həmişə teatra yaxın və bağlı olmuşam. Bu ötəri hiss deyil, içimdən gələn bir məhəbbətdir. Teatrı çox sevirəm. Teatra məhəbbət mənim içimdə var.*

**Heydər ƏLİYEV**

Ümummilli liderimiz, ulu öndər, mərhum prezidentimiz Heydər Əlirza oğlu Əliyev Azərbaycan mədəniyyəti, ədəbiyyatı və incəsənəti üçün böyük işlər görmüşdü. Mərhum prezidentimizin söylədiyi – "yüksək mədəniyyətə malik olan xalq həmişə inkişaf edəcək" – fikri hamının dilinin əzbəri və əməli fəaliyyətinin əsası olmuşdur.

O, hakimiyyətə gəldiyi ilk gündən xalqın rifahını yaxşılaşdırmaqla yanaşı, tez-tez konsertlərə, sərgilərə və tamaşalara da gedər, hər bir incəsənət sahəsini öz nəzarəti altında saxlayardı.

Hələ 1969-cu ildə Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin birinci katibi olarkən Heydər Əliyev mədəniyyət və incəsənət sahəsində çalışanlara öz diqqət və qayğısını əsirgəməmişdi. 1974-cü ildə Azərbaycan teatrının 100 illik yubileyi onun təşəbbüsü ilə keçirilmişdi. Bu təntənə ilə keçirilən yubileydə Heydər Əliyev teatrımızın keçdiyi çətin, mürəkkəb və maraqlı tarixi yolu haqqında məruzə ilə çıxış etmiş və teatr xadimlərini təbrik edərək onlara bu çətin və şərəfli yolda uğurlar arzulamışdı.

Azərbaycan Dövlət Akademik Dram Teatrında göstərilən görkəmli dramaturqumuz İlyas Əfəndiyevin "Mahnı dağlarda qaldı" tamaşasının Dövlət mükafatı alması da Heydər Əliyevin sayəsində olmuşdu. Hələ Sovet imperiyası dövründə Azərbaycan teatrında "Xurşudbanu Natəvan", "Xəyyam",

"İblis", "Aydın", "Fərhad və Şirin", "İntizar" pyeslərinin tamaşalarına baxaraq yaradıcı kollektivə öz dəyərli məsləhətlərini vermişdi.

1993-cü ilin iyun ayında Azərbaycana ikinci dəfə hakimiyyətə gələn Heydər Əliyev 5 aprel 1997-ci ildə S.Vurğun adına ADRDT-da D.Kultinin "Əziz yalançı", 20 sentyabr 1997-ci ildə ADAMDT-da İ.Əfəndiyevin "Hökmdar və qızı", 21 sentyabr 1997-ci ildə ADAOBT-da Ü.Hacıbəyovun "Arşın mal alan", 12 aprel 1998-ci ildə ADAMDT-da B.Vahabzadənin "Özümüzü kəsən qılınc", yenə həmin teatrda 7 noyabr 1998-ci ildə B.Vahabzadənin "Hara gedir bu dünya?!", 20 iyun 1998-ci ildə Q.Qorinin "Bəxtli və bəxtsiz", 15 noyabr 1998-ci ildə ADAOBT-da F.Əmirovun "Sevil", 4 dekabr 1998-ci ildə ADMKT-da Ü.Hacıbəyovun "O olmasın, bu olsun", 26 aprel 2000-ci ildə ADAOBT-da Ə.Bədəlbəylinin "Qız qalası" tamaşalarına baxar və hər bir tamaşadan sonra əsl bir teatrşünas kimi tamaşaları təhlil edər, onların mənfi və müsbət xüsusiyyətlərini mehribancasına onlara başa salardı. Cənab Heydər Əliyevin teatra gəlməsi həmişə bayram olardı. Onun aktyorlarla, rejissorlarla, bəstəkarlarla görüşü onları yeni-yeni gözəl tamaşalar hazırlamağa ruhlandırardı.

Bəxtiyar Vahabzadənin "Hara gedir bu dünya?!" tamaşasından sonra o, səhnə arxasında dramaturqu, rejissoru, bəstəkarı və aktyorları təbrik edərək onlara öz məsləhətlərini vermişdi. Aktrisa Laləzar Mustafayeva: "Hörmətli Prezident, tamaşalara gəlib baxmağınız bizim üçün çox əhəmiyyətlidir. Amma mənə elə gəlir ki, gərgin işinizə baxmayaraq vaxtınızı bizə sərf etməyinizin, ekranda bizi izləməyinizin, sonra zəng vurub bizi təbrik etməyinizin qiyməti ölçülməzdir. Hörmətli Prezident, çox sağ olun, hamımız sizə minnətdarıq".

Dünya şöhrətli lider olan Heydər Əliyev eyni zamanda arxitektura sahəsinin də gözəl bilicisi idi. Onun rəhbərliyi dövründə Azərbaycan Akademik Milli Dram Teatrı, Ş.Qurbanov adına Azərbaycan Dövlət Musiqili Komediya Teatrı, S.Vurğun adına Dövlət Rus Dram Teatrı, Gənc Tamaşaçılar Teatrı, Azərbaycan Dövlət Akademik Opera və Balet Teatrı, Mingəçevir və Şəki Teatrları yenidən təmir və bərpa edildi.

1998-ci ildə Musiqili Komediya Teatrının təmirindən sonra Heydər Əliyev Ü.Hacıbəyovun "O olmasın, bu olsun" musiqili komediyasına baxmağa gəlir. Tamaşa bitdikdən sonra o, səhnə arxasında yaradıcı kollektivlə söhbəti zamanı deyir: "Bəzən elə olur ki, bədbəxt bir hadisə sonra böyük bir xoşbəxtliyə gətirib çıxarır. Əgər bu teatr binası dağılmasaydı, ola bilər, yeni bina tikilməyəcəkdi... Düzdür, bu bina əvvəlki binanın arxitekturası üzərində tikilibdir. Amma şübhəsiz ki, bu ondan da yaxşıdır, müasirdir. Bu çox gözəldir".

Azərbaycan teatrının 125 illiyi ilə əlaqədar cənab Heydər Əliyev yeni fərman imzalamışdı. “Azərbaycanda dünyəvi peşəkar teatrının yaradılmasının 125 illiyi” haqqında tarixi əhəmiyyətə malik fərmanda yubiley tədbirlərinin keçirilməsi göstərişi verilmişdi. Sənətşünaslıq doktoru, professor, AMEA-nın müxbir üzvü İnqilab Kərimov yazır: “27 avqust 1998-ci il tarixli, 763 saylı həmin fərman əsasında yubiley tədbirlərinin hazırlanması və keçirilməsi üzrə təşkilat komitəsinin tədbirlər planına müvafiq olaraq bir sıra dəyərli işlər görüldü... Heydər Əliyevin xeyir-duası ilə Akademik Opera və Balet Teatrının nəzdində “Qayğı fondu”nun yaradılması da teatrın tamaşalarının hazırlanması işinə kömək etdi”.

Dövlət müstəqillik əldə etdikdən sonra Azərbaycan tarixini, tarixdə mövcud olan mühüm hadisələri, mərhələləri yenidən təhlil etmək, onları müstəqillik mövqeyindən daha obyektiv, doğru-düzgün yazmaq üçün Heydər Əliyev “Kitabi-Dədə Qorqud” dastanının 1300 illik yubileyinin keçirilməsi haqqında xüsusi fərman imzaladı.

Respublika sarayında 9 aprel 2000-ci ildə keçirilən türkdilli dövlətlərin “Kitabi-Dədə Qorqud” dastanının 1300 illiyinə həsr olunmuş yubiley tədbirində mərhum Prezidentimiz böyük bir məruzə ilə çıxış etdi: “Kitabi-Dədə Qorqud” bizim ana kitabımızdır, Dədə Qorqud bizim ulu babamızdır, əcdadımızdır. Biz fəxr edirik ki, “Kitabi-Dədə Qorqud” kimi ulu əcdadlarımız vardır...

“Kitabi-Dədə Qorqud” insanları, xalqları sülhə, barışığa dəvət edir. Bizim xalqımız bu gün “Kitabi-Dədə Qorqud”un bu vəsiyyətinə sadiqdir. Ermənistan tərəfindən Azərbaycana edilən təcavüz nəticəsində torpaqlarımızın 20 faizi işğal olunubdur, işğal edilmiş ərazilərdən bir milyondan artıq azərbaycanlı yerindən-yurdundan didərgin düşüb çadırlarda ağır vəziyyətdə yaşayır. Biz böyük zərbələr almışıq. Amma bunlara baxmayaraq, Azərbaycan xalqı yenə də bütün dünyaya öz sülhsevərlik siyasətini nümayiş etdirir. Biz Dədə Qorqud yolu ilə gedirik”.

Onu da qeyd etmək lazımdır ki, Heydər Əliyev daim mədəniyyət işçilərinə, o cümlədən teatrda çalışan teatr xadimlərinə öz qayğısını əsirgəməmiş, onlara fəxri adlar və mükafatlar vermişdi.

Azərbaycan ədəbiyyatı, mədəniyyəti və incəsənəti sahəsində böyük işlər görmüş, onu yüksəklərə qaldırmış, xalqımızın etimadını qazanmış bu şəxslər: Nəsibə Zeynalova, Sara Qədimova, Cövdət Hacıyev, Vasif Adıgözəlov, Emin Sabitoğlu, Səyavuş Aslan, Elçin Əfəndiyev, Lütfi Məmmədbəyov, Muxtar Dadaşov, Zəhra Quliyeva, Aqşin Əlizadə, Habil Əliyev, Fidan Qasımova, Xuraman Qasımova, Hacıbaba Bağırov, Zeynəb Xanlarova, Zəhra Quliyeva və s. bu kimi insanlara “Şöhrət”, “İstiqlal”, “Tərəqqi” və “Azər-

baycan Bayrağı" orden və medalları vermişdi. Bununla da onların maddi rifahını yaxşılaşdırmış, onları yeni uğurlara səsləmişdi.

Heydər Əliyevin rəhbərliyi ilə 1970-ci illərin əvvəllərində Bakıda və Azərbaycanın digər bölgələrində xalqımızın böyük şəxsiyyətlərinin ev-muzeyləri yaranmağa başladı. Onun təşəbbüsü ilə ilk belə muzey dahi bəstəkarımız Üzeyir Hacıbəyovun ev muzeyi oldu. Bunun ardınca prezidentimiz ədəbiyyata, mədəniyyətə, incəsənətə öz əsərləri ilə gözəl töhfələr vermiş görkəmli şəxsiyyətlərin ev-muzeylərinin açılması haqqında fərmanlar imzaladı: ictimai-siyasi xadim, yazıçı, publisist Nəriman Nərimanovun, dramaturq, şair və nasir Cəfər Cabbarlının, professional vokal sənətinin banisi, SSRİ Xalq artisti Murtuza Məmmədovun – Bülbülün, dirijor və bəstəkar, SSRİ Xalq artisti Niyazi Tağızadənin, yazıçı, jurnalist, ictimai xadim Cəlil Məmmədquluzadənin, Xalq şairi, Əməkdar incəsənət xadimi Səməd Vurğunun, rəssam, boyakar Bəhruz Kəngərlinin, şair, yazıçı və dramaturq Hüseyn Cavidin.

Bu dahi şəxsiyyətlərin ev-muzeylərinin açılışında mərhum prezidentimiz iştirak edərək onların həyat və yaradıcılığı haqqında danışmış, muzey işçilərini təbrik etmiş və onlara uğurlar arzulamışdır.

Heydər Əliyevin qayğı və dəstəyi nəticəsində inkişaf etmiş və çiçəklənmiş Azərbaycan mədəniyyəti daim inkişafda olacaq, bizi yeni-yeni uğurlara aparacaq. Beləliklə, müstəqil Azərbaycanın mədəniyyət siyasətinin banisi olan Heydər Əliyevin bu sahədəki böyük nailiyyətləri ölkə başçısı İlham Əliyevin rəhbərliyi ilə uğurla davam etdirilərək daha da yüksək zirvələrə doğru ucalır. Odur ki, bu məqaləmi Heydər Əliyevin sözləri ilə başladım, elə onun sözləri ilə də başa vurmaq istəyirəm: **"Xalqını, onun ədəbiyyatını, mədəniyyətini, incəsənətini, dilini sevən hər bir şəxs harada olursa-olsun, xalqının ədəbiyyatının, mədəniyyətinin, incəsənətinin, dilinin inkişafına, millətinin tərəqqisinə çalışmalıdır".**



**Məlahət AĞAYEVA,**
***sənətşünaslıq üzrə fəlsəfə doktoru,***
***AMEA-nın Memarlıq və İncəsənət***
***İnstitutunun əməkdaşı***

**MÜSAHİBƏ**

## "UNUTMAMALIYIQ Kİ, DEPUTAT OLMAMIŞDAN ÖNCƏ LAÇINLIYIQ"



***Müsahibimiz 121 saylı Laçın Seçki Dairəsindən Milli Məclisə namizədliyi Yeni Azərbaycan Partiyası tərəfindən irəli sürülmüş iqtisad elmləri üzrə fəlsəfə doktoru Mahir Abbaszadədir.***

**– Hakim partiyanın 121 saylı Laçın Seçki dairəsindən namizədliyinizin irəli sürülməsini necə qarşıladınız? Gözlənilən idimi?**

– Düzünü deyim ki, Yeni Azərbaycan Partiyasından namizədliyimin irəli sürülməsi həm gözlənilən idi, həm də gözlənilməyən. Gözlənilən idi ona görə ki, hakim partiyanın siyasi kursunu həmişə dəstəkləmişəm, daim partiyanın yanında olmuşam. Açığı, böyük bir partiyanın mənə bu dərəcədə etimad göstərməsi bir qədər gözlənilməz olsa da, sevindiricidir. Bu etimada görə ilk növbədə partiyanın rəhbəri İlham Əliyev cənablarına minnətdaram. Partiya sıralarındakı fəaliyyətimi yüksək qiymətləndirərək 121 saylı Laçın Seçki Dairəsindən namizədliyimi irəli sürən idarə heyətinin üzvlərinə də təşəkkürümü bildirirəm ki, mənə belə bir fürsət verdilər.

**– Artıq deputatlığa namizədlərin təbliğat-təşviqat kampaniyasına start verilib. Özünüzü seçicilərə necə təqdim edəcəksiniz?**

– Düşünürəm ki, – istər namizəd olaq, istər deputat, istərsə də adi vətəndaş, – laçınlının qarşısına ən əvvəl bir laçınlı kimi çıxmalıyıq. Həyatımın

dərk etdiyim hissəsi, əməli fəaliyyətə başladığım hissəsi rayonumuza, elimizə, obamıza, respublikamıza çox mötəbər xidmətlərdən keçibdir. Seçki oldu-olmadı, gücüm, imkanım çatacaq səviyyədə rayonumuzdan olan insanlardan köməyimi əsirgəməmişəm. Amma Yeni Azərbaycan Partiyasının namizədi kimi bu siyasi proseslərə qoşularaq laçınlıların qarşısına çıxmaq və onlardan səs istəmək iqtidarını özümdə hiss edərkən məsuliyyətim bir az da artır. Mən indiyədək laçınlıların problemlərinə bir laçınlı kimi ürəyimin səsinə qulaq asaraq kənardan yaxınlaşırdımsa, millət vəkilliyinə namizəd olaraq problemlərin içinə girmək imkanı qazanaır, onların qarşısına ən yaxşı təmsilçiləri olaraq çıxmağı öz öhdəmə götürürəm. Çalışacam ki, bütün seçicilərim məni özlərinin balası, qardaşı, əmisi oğlu, dayısı oğlu, bibisi oğlu və bir parçası, ayrılmaz hissəsi kimi qəbul etsinlər.

**– Cəmiyyətdə tez-tez belə fikirlər səslənir ki, parlamentdə hüquqşünaslar və iqtisadçılar çoxluq təşkil etməlidir. Bu həm də sosial sifarişdir. Bir iqtisadçı alim olaraq parlamentdə yerinizi necə görürsünüz?**

– Əslində bu cəmiyyətin çox doğru bir tələbidir. Eyni zamanda diqqətinizə çatdırım ki, əhalinin sosial sifarişi bir də onunla əlaqəlidir ki, parlamentdə gəncləşmə getməlidir. Bilirsiniz ki, ölkə rəhbərinin gənclərlə bağlı siyasətinin tərkib hissəsindən biri də gənclərin Azərbaycanın ictimai-siyasi həyatında əvəzedilməz rol oynamasıdır. Necə ki, bu gün gənclər əsgəri xidmətdə Vətənin keşiyində durur, necə ki, ölkə universitetlərində və xaricdə təhsillərini davam etdirirlər ki, gələcəyin çox yaxşı mütəxəssisləri, iqtisadçıları, alimləri, həkimləri, mühəndisləri kimi yetişsinlər, eyni zamanda onların ictimai-siyasi proseslərdə aktivliyi də vacibdir. Cənab Prezidentin birbaşa fikridir ki, ölkənin ictimai-siyasi həyatının ayrılmaz tərkib hissəsi olaraq parlamentdə də gənclərə xüsusi yer verilməlidir. Bu nöqteyi-nəzərdən YAP tərəfindən mənim və mənimlə bərabər digər gənclərin dəstəklənməsini ölkə başçısının gəncliyə olan diqqətinin bir hissəsi kimi qiymətləndirirəm.

O ki qaldı sualınızın əsas hissəsinə, Azərbaycan istər regionumuzda, istərsə də qitəmizdə iqtisadi cəhətdən çox inkişaf etmiş bir dövlətdir. Azərbaycanın qısa vaxtda qazandığı iqtisadi uğurlar digər dövlətlərin uzun müddət ərzində nail ola bildiyi iqtisadi uğurlardan üstündür. Bu, ölkə rəhbərinin apardığı iqtisadi siyasətin məntiqi nəticəsidir. Əsası Ulu Öndərimiz tərəfindən qoyulan bu siyasət indi də İlham Əliyev cənabları tərəfindən ləyaqətlə, yüksək səviyyədə yerinə yetirilir. Milli Məclisə üzv seçilərəmsə, başlıca məqsədim bu dövlətin iqtisadi sahədə həyata keçirdiyi tədbirlərin, onun qanunverici bazasının hazırlanmasında əməli fəaliyyətimlə yaxından iştirak etmək olacaq. Lazım olan təklifləri verərək, bu təkliflərin parlament səviyyəsində müzakirəsinə nail olmağa və onların iqtisadi sahədə qəbul olunmuş

qanunlarda öz əksini tapmasına çalışacam. Təbii ki, bu iqtisadi qanunların qəbulu, onların parlament tərəfindən ratfikasiya olunması qanunları daha çox işlək vəziyyətə gətirib çıxardacaq və qanunlar işlək vəziyyətdə olduğu müddətdə iqtisadi sahədə Azərbaycanın uğurları daha da artacaq. Hər bir vətəndaş bu uğuru öz həyatında hiss edəcəkdir. Üzvü olduğum hakim siyasi partiyanın bu 23 ildə qarşısında duran ən ümdə vəzifələrdən biri də Azərbaycanda iqtisadiyyatın yüksələn xətlə inkişaf etdirilməsidir. Hər bir insanın sosial vəziyyəti yaxşılaşmalı, bərabər hüququ qorunmalıdır. Parlamentə seçiləcəyim təqdirdə fəaliyyətimi bu istiqamətdə davam etdirmək niyyətindəyəm.

**– Məcburu köçkünlük həyatı yaşayan seçiciləri təmsil etmək ikiqat məsuliyyətdir. Bu məsuliyyətə hazırsınızmı? Parlamentdə daha çox hansı problemləri qabartmaq istərdiniz?**



– Doğru deyirsiz, məcburi köçkün həyatı yaşayan insanları parlamentdə təmsil etmək ikiqat məsuliyyətdir. Tam səmimi olaraq deyim ki, həm də çox şərəfli bir işdir. Seçicilərim mənə səs versələr, bu yüksək tribunadan təmsil olunmağıma şərait yaratsalar həm də üzərimə böyük bir məsuliyyət qoymuş olacaqlar.

Qaçqınlıq həyatı mənə yaxşı tanışdır. Bütün laçınlı soydaşlarım kimi 1992-ci ildə rus-erməni hərbi birləşmələrinin torpaqlarımızı işğal etməsi səbəbindən kəndimdən-kəsəyimdən qaçqın düşüb Sumqayıtda, Bakıda məskunlaşanlardan biriyəm. Yataqxana həyatına da yaxşı bələdəm. Təxminən 10 ilə yaxın yataqxana həyatı yaşamışam. Ailə üzvlərimlə birlikdə Sumqayıtın 41-ci məhəlləsində yerləşən 8 №-li tələbə yataqxanasında yaşamışam. Bir nəfər üçün, ən yaxşı halda iki nəfər üçün nəzərdə tutulmuş otaqda 7 nəfər qalırdıq. O həyatın nə qədər acılı, nə qədər çətin, nə qədər məşəqqətli olduğunu unutmamışam. Yəqin ki, ötən əsrin 92-93-cü illəri xatirinizdədir. Hakimiyyətin çox zəif olduğu və hərc-mərciliyin hökm sürdüyü bir zaman idi. Ölkənin iqtisadi qüdrəti olduqca aşağı bir vəziyyətə düşmüşdü. Gündəlik qayğılarını həll edə bilməyən yerli əhali belə bu qayğıların öhdəsindən gələ bilmirdi. O ki qala qismətinə məcburu köçkünlük həyatı yazılmış bir insan olasan. Evin olmaya, işin olmaya, yataqxana şəraitində yaşayasan. Ən pisi də odur ki, stabil bir dövlətin

olmaya. Problemlərinin öhdəsindən gəlmək üçün hansı ünvana gedəcəyini, kimin qapısını döyəcəyini bilməyəsən. Biz bu günləri yaşamış insanlarıq.

Allaha şükürlər olsun ki, Ulu Öndərimiz 93-cü ildə hakimiyyətə gəldi. Bütün əhali bu gəlişi çox yüksək səviyyədə qarşıladı. Ulu Öndərin fəaliyyəti nəticəsində Azərbaycanda bütün problemlər zaman-zaman öz həllini müsbət istiqamətdə tapmağa başladı. Məcburi köçkünlərin də həyatında böyük dəyişiklik oldu. Hər şeydən əvvəl dərk etdik ki, ölkənin sahibi gəlib. Məcburi köçkünlər ulu öndər Heydər Əliyevin, bu gün isə dövlətimizin başçısı İlham Əliyevin siyasətini həmişə dəstəkləyiblər, bu siyasətin öncüllərindən olublar. Dövlət rəhbəri ilə xalqın birliyi nəticəsində qaçqınların və məcburi köçkünlərin həyatında demək olar ki, köklü dəyişikliklər baş verdi. Nədən ibarət idi bu dəyişmə?

Bilirsiniz ki, ölkə rəhbəri cənab İlham Əliyevin sərəncamları ilə Azərbaycanda məcburi köçkünlər üçün yeni qəsəbələr salınıb. Bu qəsəbələr çox yüksək səviyyədə inşa edilib və insanlar artıq çadır həyatını tərk edərək rahat evlərdə yaşayırlar. Laçınlılar da mənzil şəraiti yaxşılaşdırılanların içərisindədir, bunlardan kənarda deyil. Qaradağ, Abşeron rayonlarının ərazisində salınmış müasir qəsəbələrdə də laçınlılar məskunlaşdırılmışdır. Ağcabədi rayonunun ərazisindəki Taxtakörpü qəsəbəsində də laçınlı ailələr üçün fərdi evlər tikilib istifadəyə verilmişdir. Ən sevindirici hal burasındadır ki, bu gün də məcburi köçkünlərin mənzil şəraitinin yaxşılaşdırılması birbaşa dövlət başçısının nəzarətindədir.

Bir məsələni də xatırlatmaq istəyirəm ki, cənab Prezidentin məcburi köçkünlərə, xüsusilə də laçınlılara olan məhəbbəti özünün ad günündə bir daha nümayiş olundu. Prezident ad gününü laçınlılarla bir yerdə qeyd etdi və orada bir ifadə işlətdi ki, hər kəs öz ad gününü öz evində, ailəsində keçirdir, bu gün Ağcabədidəki Taxtakörpünü özümə ev hesab edirəm, laçınlıları özümə ailə hesab edirəm və sizinlə birlikdə ad günümü qeyd edirəm. Bu cənab Prezidentin bir daha laçınlılara olan diqqətinin, qayğısının göstəricisidir. Düşünürəm ki, zaman gəldikcə ölkə rəhbərliyinin xüsusi qayğısı ilə bütün məcburi köçkünlərin həyat şəraiti daha da yaxşılaşdırılacaq, onlar yataqxanalardan, məktəblərdən və bağçalardan çıxarılaraq rahat evlərdə yerləşdiriləcəklər. Amma qaçqın və məcburi köçkünlərə burada nə qədər gözəl şərait yaradılsa da, bu insanlar nə qədər ev-eşiklə təmin olunsa da, hamımızın içində bir nisgil var. Bu nisgil Vətənə, itirilmiş torpaqlarımıza qayıtmaq nisgilidir. Vəziyyətin, şəraitin yaxşılaşdırılması heç də insanları torpaqlarından soyutmur. Əksinə, xalq görür ki, ölkə rəhbəri, Ali Baş Komandan ona qarşı necə diqqətlidir. Mənə elə gəlir ki, mənzil şəraiti yaxşılaşdırılan hər bir laçınlının dövlətə inamı bir daha artır və düşünür ki, dövlət başçıs-

ının qətiyyəti və xalqın birliyi sayəsində torpaqlarımızı geri alacağıq. Cənab Prezident öz çıxışlarında torpaqların alınma yollarını da dəfələrlə qeyd edibdir. Qeyd edibdir ki, hələ ki siyası yollar tükənməyib, hələ ki siyasi mübarizə aparılır və siz görürsüz ki, ölkəmizin iqtisadi qüdrəti, hərbi potensialı artıqca onun siyasi gücü də artır. Beynəlxalq miqyaslı ən mötəbər tədbirlərdə, ən ali kürsülərdə ortaya prinsipal mövqe qoyan dövlət başçısı işğal olunmuş torpaqların, xüsusilə Laçının tarixi Azərbaycan torpaqları olduğunu dönə-dönə vurğulayır.




İkinci bir məsələni deyim, əgər siyasi müstəvidə danışıqlar bir nəticə verməsə, Azərbaycan nəyin bahasına olursa-olsun, öz torpaqlarını geriyə alacaqdır. Bu alınmanın içərisində təbii ki, hərbi yol istisna deyil və bu sahədə Azərbaycan dövlətinin üstünlükləri göz önündədir. Danılmaz faktdır ki, dövlətimizin hərbi sahəyə ayırdığı vəsait Ermənistanın ümumi büdcəsinə bərabərdir. Eyni zamanda Azərbaycan Respublikasının Hərbi Sənaye Nazirliyi yaradılıbdır. Hərbi Sənaye Nazirliyi bu gün dünyanın ən müasir silahlarını istehsal etmək gücündədir. Azərbaycan artıq dünya arsenalında silah istehsal edən bir dövlət kimi də tanınmaqdadır. Ordumuz da günü-gündən möhkəmlənir. Ordumuzun möhkəmlənməsi, iqtisadi gücünün artırılması, müasir silahlarla təchiz olunması bir daha Azərbaycan dövlətinin işğal altındakı torpaqlarımızı hansı yolla olur-olsun geriyə qaytarmaq gücünü özündə saxladığını göstərir. Elə sizə müsahibə verdiyim ərəfədə, 3-4 gün bundan öncə Azərbaycan ordusu cəbhə xəttində nəyə qadir olduğunu göstərdi. Erməni tərəfinin artıq təşvişə düşməsi, böyük itkilər verərək geri çəkilməsi və bunu Ermənistanın müdafiə nazirinin etiraf etməsi bir daha ordumuzun gücündən, qüdrətindən xəbər verir.

**– Laçınlı məcburi köçkünlər həm də respublikanın 60-a yaxın rayonunda məskunlaşıblar. Regionlarda yaşayan seçicilərin hamısı ilə görüşmək planınız varmı? Çətin olmayacaq ki?**

– Bildirim ki, deputatlığa namizəd irəli sürüldükdən sonra bu dislakasiya ilə bağlı bir az dərindən tanış olmağa başlamışam. Rayonumuzun əhalisi respublikanın təxminən 58 rayonunda yerləşib. Bizim bunların hamısının səsini almaq fikrimiz var. Laçın rayonunda 45-46 min seçici vardır ki, bunlar da müxtəlif bölgələrdə məskunlaşmışdır. Təxminən 24 mini Bakı, Sumqayit və Abşeron ərazisində, 21 mini isə regionlarda yerləşir. Mərkəsi Seçki Ko-

missiyası yalnız 20 gün təbliğat-təşviqat kampaniyası aparmağa icazə verir. Çalışacağıq ki, bu 20 gün müddətində həm Bakıda, Sumqayıtda, Abşeronda, həm də respublikanın digər rayonlarında məskunlaşan bütün seçicilərimizlə təmas quraq. Onların hamısı ilə görüşə bilməsəm belə, mənim səlahiyyətli nümayəndələrim mütləq o adamlarla görüşəcəkdir. Jurnalınız vasitəsilə onların hamısına salam-dualarımı çatdırıram. Əgər mənə etimad göstərsələr, parlamentin deputatı olduqdan sonra da onların problemləri ilə yerindəcə tanış olacam. Bu seçki dönəmində isə mənim 20 günlük işim ancaq və ancaq seçicilərimlə işləməyə, onların suallarına cavab axtarmağa, arzu və təkliflərini dinləməyə yönələcəkdir. Elə məsələlər var ki, namizəd olaraq həll etmək mümkündür və deputatlıq dönəminə saxlamağa ehtiyac yoxdur. Ancaq elə məsələlər də var ki, həll etmək üçün ən azı millət vəkili səlahiyyətində olmalısan. Daha çətin problemləri isə uyğun nazirliklərin və komitə sədrlərinin qarşısında qaldıraraq bu problemin həlli yollarını seçicilərimizə göstərəcəyik. Yəni bu problemlər müxtəlif cürdür. Onlara yanaşmaq da müxtəlif formalarda olacaq. Eləsi var özümüz həll edəcəyik, eləsi var yerli hakimiyyət səviyyəsində, eləsi var nazirlik səviyyəsində həll olunacaq, eləsi var zaman-zaman o problemlərin həllinə yenidən qayıdacağıq. Bütün hallarda, yəni mənə səs verən, səs verməyən istənilən laçınlının probleminə heç bir fərq qoymadan yanaşacağıq. Unutmamalıyıq ki, deputat olmamışdan öncə Laçınlıyıq. Eyni problemləri yaşayan insanlarıq. Ermənilər bizi öz torpaqlarımızdan didərgin salanda fərq qoymayıbdır ki, bu YAP-ın üzvüdür, o biri digər partiyanın. Kimsə deputatdır, yaxud sadə bir fəhlədir. Vəzifəli şəxsdir, yoxsa işsizdir. Ona görə də Laçına qayıtmaq bizim hamımızın problemidir.

Vaxt qısa olsa da, seçki kampaniyası müddətində çalışacam ki, bütün seçicilərimlə görüşüm. Millət vəkili seçilərəmsə, qarşımda hələ 5 ilim olacaq. Tam məsuliyyətimlə bildirirəm ki, həmin müddətdə 58 rayonda məskunlaşmış heç bir laçınlı diqqətdən kənarda qalmayacaq.

– **Yeri gəlmişkən, son dövrlərdə müəyyən qüvvələr sanki Laçında “kürd problemi varmış” təəssüratını yaratmağa çalışırlar. Sizcə bu nədən qaynaqlanır? Milliyətcə kürd olan seçicilərin də səsini almağa əminsinizmi?**

– Çox sağ olun. Bu sual gözlənilən idi, çünki qonşu Türkiyə Pespublikasında baş verən hadisələr bizdən yan keçmir. Laçın rayonu etnik tərkibinə görə mürəkkəb bir region olmasa da, təkcə türklərdən də ibarət deyil. Əhalisinin böyük əksəriyyətini türklər təşkil edən rayonda say tərkibinə görə ikinci yerdə kürdlər gəlir və az sayda digər millətlərin nümayəndələri də yaşayır. Bizim rayonda tarixən türklər də, kürdlər də, digər millətlərin nümayəndələri də bir yerdə çiyin-çiyinə yaşayıbdır. Xüsusilə, kürdlərlə münasi-

bətlər elə bir səviyyəyə gəlib çatıbdır ki, heç kəs bu iki milləti bir-birindən ayırmaq haqqında düşünməyib. Qohum olublar, qaynayıb-qarışıblar. Tam məsuliyyətimlə deyə bilərəm ki, Laçın rayonunda, ümumiyyətlə Azərbaycanda belə bir problem yoxdur. Laçın rayonunu, Azərbaycanı istəməyən, sabitliyi pozmağa can atan qüvvələr "kürd kartı"ndan istifadə etməyə başlayıblar. PKK əslində kürd demək deyil. Kimsə PKK-nı kürdlə eyniləşdirirsə, böyük siyasi səhvə yol verir və ola bilsin ki, nə türkün tarixindən xəbəri var, nə kürdün, nə də PKK-nın. Necə ki, İŞİD müsəlman deyil, eləcə də PKK kürd anlamına gəlmir. PKK-nın tərkibində Türkiyəni, Azərbaycanı sevməyən qüvvələrin, əsasən də ermənilərin vuruşduğu artıq heç kəsə sirr deyil. Bu terror təşkilatının tərkibində elə qüvvələr də var ki, nəyin uğrunda vuruşduqlarının fərqində deyillər. Mən inanmıram ki, Azərbaycanda yaşayan hansısa bir kürd və ya qeyri bir millət o syasəti bəyənir və dəstəkləyir. Nəinki Azərbaycanda yaşayanların, bütün dünyada yaşayan azərbaycanlıların, ulu öndərimiz Heydər Əliyev demiş, bir Vətəni var. O da Azərbaycandır. Sizin xatirinizdədirsə, ulu öndər Heydər Əliyev hakimiyyətə gəldikdən sonra Azərbaycanda azərbaycançılıq ideyasının sürətli inkişafına nail ola bildi. Azərbaycanda yaşayan türk də, kürd də, ləzgi də, talış da, tat da, avar da və digər bütün millətlər də bu ideyanın ətrafında birləşərək Azərbaycan dövlətini təmsil edir. Laçın rayonu da Azərbaycan dövlətinin ayrılmaz bir hissəsidir. Haqlı olaraq ortaya bir sual çıxır. Bəs niyə Azərbaycanı istəmirlər, bu "problemlər"i qabartmaq istəyirlər? Əslində heç bir problem yoxdur. Mənim kürdlərin içərisində çoxlu dostlarım, qohumlarım var, onların ağsaqqalları ilə çox yaxın bir münasibətdəyəm. Onu da bildirmək istəyirəm ki, namizədliyim irəli sürüləndən sonra demək olar ki, kürd əsilli insanlar öz namizədliklərini vermədilər, ərizə belə yazmadılar, düşündülər ki, mən onların da namizədiyəm. Laçın rayonunda olmayan problemi süni şəkildə şişirdənlərin arxasında xarici dövlətlərin əks-kəşfiyyat dairələri dayanır.



Möhtərəm Prezidentimiz İlham Əliyevin və Azərbaycanın birinci xanımı Mehriban Əliyevanın Azərbaycan dövlətini dünyada tolerant bir dövlət kimi tanıtmasını bəzi dövlətlər hələ də həzm edə bilmir, bəziləri isə artıq həzm etmək məcburiyyətindədir. Azərbaycanda multikulturalizm mühiti hökm sürür, heç bir fərq qoyulmadan bütün millətlər eyni hüquqlarla yaşayırlar. Multikultiralizmin inkişaf etdiyi bir ölkədə müxtəlif mədəniyyətlərin,

dinlərin daşıcıyısı olan insanların bir yerdə bərabər yaşaması hamımızın gözü önündədir. "Kürd kartı" da bunu gözü götürməyən dövlətlərin Azərbaycandakı tolerantlığa, multikulturalizmə qarşı apardığı bir mübarizə formasıdır. Bu süni problemi Laçın rayonunda qabartmaq istəyənlər yanılırlar və heç vaxt məqsədlərinə çatmayacaqlar. Bir daha təkrar edirəm ki, seçicilərim mənə səs verərsə, Laçın rayonunda hamının, – türkün də, kürdün də, rusun da, yəni milli mənsubiyyətindən asılı olmayaraq hər kəsin millət vəkili olacam.

**– İndiyədək bizi təmsil edən deputatlar da laçınlı olublar. O da məlumdur ki, laçınlılar kiçik istisnalarla rayonun rəhbərinə də, deputatına da həmişə ehtiramla yanaşıblar. Amma Laçından seçilən deputları parlamentdə qeyri-fəal olduqlarına görə qınayanlar da az deyil. Bu sindromu sındıra biləcəksinizmi?**

– Partiya namizədliyimi irəli sürərkən və bu siyasi aksiyaya razılıq verərkən təbii ki, bunların hamısını ölçüb-biçmişəm. Bir az təvazökarlıqdan uzaq olsa da deyim ki, mən iqtisad elmləri üzrə fəlsəfə doktoruyam, iqtisadiyyat institutunun doktoranturasında ikinci ildir təhsil alıram, 7 elmi məqalənin, 3 elmi tezisin, 1 elmi monoqrafiyanın müəllifiyəm və bir neçə xarici dil bilirəm. İntellekt səviyyəm, dünyagörüşüm imkan verir ki, məsuliyyəti öz üzərimə götürərək bu sindromu sındırım. Çalışacam ki, bundan sonra Laçın rayonunu Milli Məclisdə təmsil edən deputat haqqında "qeyri-fəal" ifadəsi işlədilməsin. Çünki millət vəkili haqqında o ifadənin işlənməsi hər bir laçınlıda təəssüf doğurur. Onu da bildirim ki, namizədliyimiz irəli sürülərkən partiyamızın rəhbəri cənab İlham Əliyevin qarşımıza qoyduğu əsas tələblər və tapşırıqlar da diqqətimizə çatdırılıb. Deyilib ki, Yeni Azərbaycan Partiyasının sədri hər bir deputatdan istər siyasi, istər iqtisadi, istərsə də gündəlik ictimai-sosial proseslərə münasibətdə xüsusi fəallıq tələb edir. Hər kəs yaxşı anlamalıdır ki, problemlərin hamısını cənab Prezident həll etməli deyil. Bütün siyasi partiyalar, xüsusilə parlamentdə böyük səs çoxluğuna malik Yeni Azərbaycan Partiyasının dəstəyi ilə seçilmiş millət vəkillərinin borcudur ki, onların arxasında duran seçicilərin fikirlərini efadə etsinlər. Seçici noyabrın 1-də millət vəkilini seçərkən səhv etmədiyinə, səsinin havayı getmədiyinə və düzgün qərar verdiyinə inanmalıdır.

**– 121 saylı Laçın seçki dairəsindən 10-a yaxın deputatlığa namizəd rəsmi qeydiyyatdan keçib. Sevindirici haldır ki, laçınlı namizədlər ötən seçkilərdə də mübarizəni ləyaqətlə aparıblar. Ümidvarıq ki, indiki seçkilərdə də bu ənənə qorunacaq. Siz necə düşünürsünüz?**

– Bu bir mübarizə formasıdır və cəmi 20 gün çəkəcək. Keçmiş seçkilərdə də deputatlarla bu və ya digər dərəcədə münasibətim olub. Aktiv seçki prosesində iştirak etməsəm də, dediyiniz məsələnin müzakirəsinə tez-

tez rast gəlirdim. Yəni toxunduğunuz məsələ o zaman da aktual idi. Mən də dərk etməliyəm, mənimlə bərabər bu mübarizəyə qoşulmuş namizədlər də dərk etməlidirlər ki, bir nəfər namizədə seçki dairəsi düşmür. Ən azı 2-3 namizəd olmalıdır.

Namizədlərin siyahısına baxmışam, hamısı laçınlıdır, digər yerlərdən yoxdur. Biz isə bir-birimizi hansısa formada tanıyırıq. Dilindən, dinindən asılı olmayaraq hər bir laçınlını qohumluq, qonşuluq və dostluq əlaqələri birləşdirir. 20 günlük seçki prosesindən sonra Mərkəzi Seçki Komissiyası seçilən namizədi elan edəcək. Təbii ki, seçilməyənlər laçınlılıqdan çıxmayacaq. Mən indidən bu seçkidə qalib gələcək insanı təbrik edirəm. Kim qalib gələcəksə, indidən onun əlini sıxmağa hazıram. Biz noyabrın 1-dən sonra xeyir-şərdə, tədbirlərdə bir yerdə olacağıq. Mən inanmıram ki, hansısa laçınlı Laçını başqa laçınlılardan çox istəsin. Hamının qəlbində bir Laçın sevgisi var. Gərək elə edək ki, seçki kampaniyası başa çatandan sonra görüşəndə utanmayaq. Atalarımızın da gözəl bir deyimi var: "Dalaşanda elə dalaş ki, barışmağa üzün olsun".



Mən inanıram ki, bu dəfə də namizədliyi qeydə alınmış laçınlılar siyasi mübarizəni ləyaqətlə aparacaq və heç kəs 20 gün müddətində özümüzə aid olmayan nalayiq fikirlərlə yaddaşlarda qalmaq istəməyəcək. Televiziyada, yazılı mətbuatda, saytlarda və sosial mediada çıxışlarımız zamanı Laçını təmsil etdiyimizi yaddan çıxarmamalıyıq. Şəxsən mənim üçün namizədlərin hər biri əzizdir. Həm də ona görə əzizdir ki, bu insanlar özlərində cəsarət taparaq qalib gəlmək əzmi ilə mübarizəyə qoşulublar. Onlara hörmətimin bir səbəbi də budur. Elə sizin tribunanızdan mübarizəyə qoşulan namizədlərin hər birinə uğurlar arzulayıram!

*Bu gün suallarımızı namizəd kimi cavablandıran müsahibimizlə Milli Məclisin üzvü kimi həmsöhbət olmaq arzusu ilə:*

**Arif MƏMMƏDLİ**

SAĞLAMLIQ KEŞİKÇİLƏRİ

## HAMLET HƏKİM



Bəşəriyyətin inkişaf tarixi boyunca insanların sağlam həyat tərzinin qorunub saxlanması üçün müxtəlif xəstəliklərin müalicəsi və qarşısının alınması üçün tibb elminin yaranmasına böyük ehtiyac duyulmuşdur. Bu sahədə xalq təbabətindən tutmuş dövrün tələblərinə cavab verən müasir tipli tibb ocaqlarının yaradılmasına qədər bu elm uğurla inkişaf etmişdir. Bu elmin sirlərinə yiyələnən, həkim sənətini seçən hər bir kəs "Hippokrat andı" deyilən bir and içməli, həkimlik sənətinin müqəddəsliyi qarşısında dayanan öhdəlikləri qəbul etməlidir. Təbabət qaydalarına sadiqliyi özündə ehtiva edən bu andın dəyərlərinə sahib olmaq üçün hər bir həkim öz məsuliyyətini hiss etməli, bacarığına, biliyinə düzgün qiymət verməli, insanların yaşam varlığına cavabdeh olmalarını yaddan çıxarmamalıdırlar. Eyni zamanda bu andı içdikdən sonra həyatlarının da bu anda cavabdehlik daşıdığını bilməlidirlər. Çünki, Hippokrat andında həkimlərin özlərinə aid "Andıma sadiq olaramsa qoy həyatımda və sənətimdə nəsibim xoşbəxtlik və insanların rəğbəti, olmaramsa bunun əksi olsun" kəlmələri həkim olan hər bir kəsi ciddi düşündürməlidir.

Mən sizə and içərək verdiyi sözə və götürdüyü öhdəliklərə lazımi səviyyədə cavab verən, təbabət qaydalarına sadiqliyini dəfələrlə sübut edən bir həkimdən – Laçın rayonu Mişni kənd sakini Əsədov Hamlet Sərdar oğlundan danışmaq istəyirəm. Bu yazını yazanda Hamlet həkim dedi ki, müəllimə, özünüzə əziyyət verib niyə bu yazını yazırsız? Borcumuzdur, insanların sağlamlığı keşiyində durmalıyıq. Təvazökarlıqla deyilən bu sözlərdən sonra mən ona cavab verdim ki, bu yazını yazmaqda məqsədim odur ki, həm sizin kimi savadlı və dəyərli gənc həkimlərimizi tanısınlar, həm də indiki dövrdə sağlamlığa böyük ehtiyacları olan insanlar sizin kimi həkimlərin müalicələrindən yararlanaraq şəfa tapsınlar.

Hamlet həkim haqqında:

Hamlet həkim 1 mart 1978-ci ildə Laçın rayonunun Mişni kəndində həkim ailəsində dünyaya göz açıb. Atası Sərdar həkim və tibb bacısı olan anası Rəna xanımın tərbiyəsi ilə böyüyən Hamlet qardaşı Cavidlə (ailədə iki uşaq olublar) birlikdə uşaqlıqdan bu sənətə böyük maraq göstərmiş, sonda hər ikisi həkimlik sənətinin dalınca getmişlər. Sərdar həkim o vaxtlar kənddə

yeganə və savadlı həkim kimi nəinki kəndimizin, həmçinin, ətraf kənd camaatının da sağlamlığının keşiyində layiqincə dayanmışdır.

Balaca Hamlet 1984-cü ilin sentyabrında Laçın rayon Mişni kənd orta məktəbinin birinci sinfinə getmiş, 1992-ci ilə qədər bu məktəbdə oxumuş, 1992-ci ilin mayından məlum Qarabağ müharibəsi ilə əlaqədar köçkün olaraq Qaradağ rayonunun Sahil qəsəbəsində ailəsi ilə birlikdə məskunlaşmış, 1995-ci ildə burada Laçın rayon 7 №-li tam orta məktəbini müvəffəqiyyətlə bitirmişdir. Elə həmin il N.Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutuna (indiki ATU) qəbul olmuş, 2001-ci ildə ali təhsilini başa vurmuş, əlavə bir il internatura təhsili alaraq həkimlik ixtisasına yiyələnmişdir.

2002-2003-cü illərdə N saylı hərbi hissədə tabor məntəqə rəisi vəzifəsində, 2003-2004-cü illərdə briqada tibb məntəqəsində həkim kimi çalışmışdır. Burada əsl tibb işçisi və vətənpərvər olaraq əsgərlərimizə layiqincə tibbi xidmət göstərmiş, şəxsi heyət və əsgərlərimizin dərin rəğbətini qazanmışdır.

Həkimlə söhbət zamanı onun mənim üçün maraqlı olan fikirlərini sizə də çatdırmaq istəyirəm. **Həkimin dediklərindən:** "Ordunun özünəməxsus xəstəlikləri var. Zabit olub həkim kimi hərbi hissədə çalışmayan adam üçün müharibə şəraiti olduqda işləmək çətin olur. Fövqəladə şəraitə hər zaman hazır olmaq üçün orduda xidmət etmək hər bir həkim üçün vacib şərtdir". Ordudakı xidmətindən məmnunluqla danışması onu göstərir ki, Hamlet həkim Vətən yolunda xidmətə hər zaman hazırdır.

Hərbi xidmətini başa vurduqdan sonra Hamlet həkim 2004-cü ildən Qaradağ rayonu Sahil qəsəbəsində 20 saylı Təcili Tibbi Yardım Stansiyasında həkim, həmçinin 2006-cı ildən 23 saylı Birləşmiş Şəhər Xəstəxanasında həkim-onkoloq kimi çalışır.

Hamlet həkimin xidmətləri çox böyükdür. Xüsusən də, zavodların çox olduğu, buna görə də ekoloji durumu çox ağır vəziyyətdə olan bu rayonun sakinlərinin sağlamlıq problemləri çox olduğu üçün belə həkimlərə böyük ehtiyac var. Hamlet həkim bu cəhətdən nəinki qəsəbə sakinlərinin, həmçinin Bakı şəhər sakinlərinin də ümid yeridir. Əsasən Qaradağ rayonunun Ümid qəsəbəsində köçkün olaraq məskunlaşmış Mişni kənd camaatı Hamlet həkimə çox minnətdardır. Həkimin hər zaman camaatımızın yanında olması, onlara sağlamlıqlarına qovuşmaqda dəstək olması hər bir sakin üçün əvəzsiz xidmətdir.

Onu da deyim ki, Hamlet həkimin qardaşı Cavid həkim də öz peşə borcunu layiqincə yerinə yetirir. Sahil qəsəbəsində yerləşən Qaradağ Sement Zavodunda fəaliyyət göstərən tibb məntəqəsində həkim kimi çalışan Cavid həkim də həm zavodun işçilərinin, həm də qəsəbə sakinlərinin sağlamlığı keşiyində müqəddəs peşə fəaliyyətini davam etdirməkdədir.

Hamlet həkim xəstəliyi doğuran obyektiv və subyektiv amilləri diqqətlə öyrənir, lazım olduqda onları təyinatı üzrə lazımi yerlərə göndərməyə köməklik göstərir, həmin xəstələrə bacardığı qədər dəstək olaraq tanınmış həkimlərlə əməkdaşlıq edir. Məhz bu əməkdaşlıqda onun bilik və savadına, həkimlik təcrübəsinə görə türk həkimləri ona "Uzman həkim" deyərək müraciət edirlər.

Hamlet həkim ailəlidir, iki övladı – bir qızı və bir oğlu var. Həkim həm də dəyərli ailə başçısıdır. Hamlet həkimə gələcək karyerasında böyük uğurlar arzulayıram. Bir müəllimi kimi Hamlet kimi şagirdlərimlə fəxr edirəm.

Sonda Tomas Brounun ibrətamiz bir kəlamını xatırladıram: "Etdiyiniz işin ən yaxşısını, bir də zamanında edin, o vaxt dağ başında olsanız belə, insanlar sizi tapar". Azu edirəm davam etdirdiyiniz müqəddəs peşənizdə yollarınız daim açıq olsun ki, insanların köməyinə zamanında yetişəsiniz. Sayənizdə sağlamlığına qovuşan insanların duaları sizinlə olsun!



**Venera MİRZƏYEVA,**
***Laçın rayonu 7 №-li tam orta məktəbin riyaziyyat və informatika müəllimi***



**Xalq rəssamı Maral Rəhmanzadə – "Laçın şəhəri" tablosu**

**POEZİYA**

**Osman ALIYEV**



## AZALIB

Dostum, gileylənmə, küsmə dünyada,
Haqq-ədalət, məslək dostu azalıb.
Sərvət tutub çoxlarının gözünü,
El-obada çörək dostu azalıb.

Haqq gəzmişəm ayaqyalın, başaçıq,
Yollar tozlu, cığırlar da dolaşıq.
Fikirləri, arzuları qarışıq
Bir-birinə gərək dostu azalıb.

Sevinc itib, çoxalıbdı qəm-kədər,
Keçən ömür gah əfsanə, həm hədər.
Badə dostu, yemək dostu o qədər,
Söykəndiyim kürək dostu azalıb.

Osman, yozma istəyincə yuxunu,
Sözü atdın, gəl gizlətmə oxunu.
Dar macalda tapammadım çoxunu,
Ürəyimin ürək dostu azalıb.

## OLMAZ

***Dostlarımdan biri Qaradağ rayonunda balaca təpələri mənə dağ kimi təqdim etdi***

Qardaş, tərifləmə boz təpələri,
Palçıq topasından Dəlidağ olmaz.
Nə laləsin gördüm, nə bənövşəsin,
Şoranda olanın canı sağ olmaz.

Bu yerin binədən görkəmi bozdu,
Nə payızı payız, nə yazı yazdı.
Yağışı zəhərdi, dumanı tozdu,
Düşmüşük elə bir dərdə, sağalmaz.

Çəmən nə gəzir ki, görəm də şehin,
Udmuruq havasın, duymuruq mehin.
Ömrün bəri başdan alıbdır behin,
Vallah bizdən ötrü belə "dağ" olmaz.

Sahil Laçın olmaz, Lökbatan Şuşa,
Dönmüşük qəfəsdə vurnuxan quşa.
Osman xəyallarla qalıb baş-başa,
Vallah Qaradağdan Qarabağ olmaz.

## O İL ÇALINMADI TOYU KƏNDİMİN

***1992-ci ildə Mişni kəndində heç kimə toy olmadı***

Bəxtə bax, dağlandı, dağ aran oldu,
Gizləndi Günəşi, gün toran oldu.
Əsdi xəzan yeli, qar-boran oldu,
Nə yaman nəhs gəldi mayı kəndimin,
O il çalınmadı toyu kəndimin.

Bülbül nazlı-nazlı ötmədi daha,
Bənövşə gülümsər bitmədi daha.
Qəlbim çəmənlərdə itmədi daha,
Qurudu bulağı, çayı kəndimin,
O il çalınmadı toyu kəndimin.

“Taxtalar” həsrətdir zurna səsinə,
“Alçalı” qarmonun təranəsinə.
“Çimənlər” İdrisin zənguləsinə
Möhtacdı, kəsilib payı kəndimin,
O il çalınmadı toyu kəndimin.

Günlər bir-birindən pərişan gəldi,
Yuxuma Həkəri, “Yolaşan” gəldi.
Nə mağar quruldu, nə nişan gəldi,
Bir az da kiçildi boyu kəndimin,
O il çalınmadı toyu kəndimin.

Qəhərim – dumanlı yağışlarında,
Həsrətim – göylərin göz yaşlarında.
Küskün qız-gəlinin baxışlarında
İllərə dönübdü ayı kəndimin,
O il çalınmadı toyu kəndimin.

Oynamaq üstündə küsən olmadı,
Hirslənib heç kimi “kəsən” olmadı.
Gəlin qabağını kəsən olmadı,
Bulandı göz yaşlı suyu kəndimin,
O il çalınmadı toyu kəndimin.

Ay Osman, zirvəni qartallar seçər,
Qıy vurar yanıqlı, dolanıb keçər.
Yuxuma girdikcə hər axşam, gecə
Bal dadır qoxusu, iyi kəndimin,
O il çalınmadı toyu kəndimin.

***Qubadlı – Bakı, 1992***

**TƏRƏF**

Yada düşdü gəncliyim,
Boylandım yaza tərəf.
Çəməndə gül-çiçəyə,
Zirvədə buza tərəf.

Gör xəyal hara çəkir,
Həsrətim dara çəkir.
Ürək bahara çəkir,
Yaş da payıza tərəf.

Osman, yalandı dünya,
Daşıb-dolandı dünya.
Çox da kalandı dünya,
Sən yıxıl aza tərəf.

**YADDAŞ**

## CAVABSIZ SUALLAR, YOXSA ERMƏNİLƏRİ MÜDAFİƏ EDƏN QÜVVƏLƏR?

Cavabı həmişə maraq doğuran suallar var: erməniləri müdafiə edən qüvvələr kimlərdir? Köklü səbəb nədir ki, bu qədər qaniçən, qəddar, işğalçı dövlətin əməllərinə dünya susur, böyük dövlətlər göz yumurlar? Fikir verirəm, neçə illərdir bizim siyasətçilər, politoloqlar hər cürə danışırlar, ancaq əsas məsələni demirlər.

İndi mən həmin suallara cavab olaraq öz düşüncələrimi sizinlə bölüşmək istəyirəm.

1967-ci ildən Laçın şəhər musiqi məktəbində müəllim işləmişəm. Məktəbin direktoru Ağdam rayonundan Məhəmməd Hacıyev idi. Məktəbdə ciddi müəllim çatışmazlığı, ixtisaslı kadra çox ehtiyac var idi. Ona görə də hər ikimiz kadr sorağı ilə gəldik Ağdama. Məqsədimizə nail olmadığımız üçün biz Xankəndi şəhərinə getməli olduq. “Uçiliş”in direktoru Levan müəllim idi. Onunla razılaşdıq. Bizim məktəbə təyinat ilə 2 nəfər tar müəllimi göndərdilər. Biri Manvel (soyadını unutmuşam), biri isə Gevorgiyan Yaşa idi. Laçın şəhərində mənimlə bir otaqda qalırdılar. Gevorgiyan Yaşa ilə çox möhkəm dost olduq. Mən onu kəndə qonaq aparırdım, o da məni evlərinə. Elə olurdu ki, hər bazar gedib onlarda qalırdım. Hər şeyi sizə olduğu kimi danışacam. Yaşanın bir qardaşı, bir bacısı, ata-anası var idi. Oxucularımdan üzr istəyirəm, bacısı 9-cu sinifdə oxuyurdu. O qədər gözəl idi ki, elə bil rəssam qələmlə çəkmişdi. Yaşadan soruşdum ki, qız nişanlı-zad deyil? Dedi ki, yox, bu qızın üstə mənim başım bəlalar çəkib, heç soruşma. Çox maraqlandım, heç nə demədi. Gəldik Laçına. Yenə çox çalışdım, axırda söz verdi ki, deyəcəm sənə, amma gərək bu sirri heç kimə deməyəcəyinə and içəsən, çünki bu sirr açılsa məni öldürərlər. **Yaşanın dedikləri:** *Dövlət bizim ailəni xüsusi nəzarətə alıb, atama, anama yaxşı iş verilib və digər köməkliklər göstərilir. Qıza isə 10-cu sinfi qurtarana qədər həftənin 2 günü dövlət təhlükəsizlik idarəsində xüsusi müəllimlər dil öyrədirlər. Əsasən ingilis dili, fransız dili, rus dili və sair dilləri öyrədirlər. Stepanakertin (Xankəndi) məktəblərində əsas seçim olur. Bir bu qız seçilib. Bir qız Hadrutdan (Xocavənd), bir oğlan isə Mardakertdəndir (Ağdərə). Stepanakert üzrə üç qız, bir oğlan hazırlanır. Məktəbi qurtaranda göndərirlər Yerevana (İrəvan). Orada da neçə nəfərdir, bilmirəm. Hər bir şey dövlət hesabına olmaqla həmin tələbələri göndərirlər Amerikaya, Avropaya. Corc Vaşinqton, Harvard universitetlərinə. Onlar Fransa və Rusiya universitetlərinə də ən yüksək qiymətlə*

*daxil olurlar, çünki seçilmiş tələbələrdir. Hamısı məktəbi qızıl medalla bitiriblər. Bu uşaqlar minlərin içərisindən seçilmiş ən gözəl, ən ağıllı, hərtərəfli hazırlanmış mükəmməl uşaqlardır. Bu uşaqlar qəbul olurlar. Orada oxuyanlar prezident, baş nazir, konqresmen uşaqlarıdır. Təbii ki, bu gözəlləri sevəcəklər, özü də necə, ifrat dərəcədə.*

*Buranın nəzarəti və göstərişi ilə bu qızlar orada ərə gedirlər. Ancaq bunları sevən oğlana çox çətinliklə razılıq verirlər: "Sənə gedirəm. Bu şərtlə ki, əlində ixtiyar olsa məzlum millətimə köməyini əsirgəməyəcəksən".*



Əziz oxucular, elə bilirəm əvvəlki sualımızın dəqiq cavabı budur və onu da qeyd edim ki, güclü zəlzələ vaxtı "Amerikanın səsi" radiosundan Ata Buşun sevimli gəlini ilə İrəvanda göz yaşı tökməsi xəbərini şəxsən özüm eşitmişəm.

Ermənilər bizə şər-böhtan yağdırırlar. Biz isə minlərlə faktı dünyaya çatdırmırıq. Əslində çatdırırıq, eşitmək istəmirlər. Bunların iç üzünü, "qeyrəti"ni, çirkin siyasətini bütün dünya bilməlidir.

1962-1965-ci illərdə Bakı Rabitə Texnikumunda oxuyurdum. O vaxtlar Mərkəzi Komitənin katibi Vəli Axundov idi. Bakıda ermənilər bizə meydan oxuyurdular. Onları Moskvanın tapşırığı ilə Axundovun müdafiə etdiyini deyirdilər. Moskvada da ermənilərin arxasında Mikoyan, Osetyan, Şahnəzəryan və s. ermənilər dayanmışdı.

**Fakt:** 1962-ci ildə Bakıda yaşayan Ağdam rayonundan Rey adlı bir oğlanı erməni arxadan bıçaqla vurub öldürdü. Rey misli-bərabəri olmayan bir igid idi. “Adam var yüz adamın əvəzidir, adam var yüzü bir adama dəyməz”, – deyərlər. Rey belə bir oğlan idi. Onun qanını ermənilər batırdı. Heç cinayətkarı tutmadılar da. Dedilər ki, anası hansısa nazirlikdə kadrlar şöbəsinin müdiridir, bacısı isə bir vəzifəli adamın gəlinidir. Bakıda demək olar ki, zavodlarda, nazirliklərdə, ali sovetdə erməni qızları, arvadları ya katibə, ya da “otdelkadr” idilər. Ermənilər ilə kim qohum olurdusa ona yaxşı iş və vəzifə verirdilər. Ermənilərin bu cür avantürist siyasətlərini qısa olaraq bir neçə faktla yazıram. Xankəndində bir neçə həkim var idi: Adamyan, Dadanyan, Atayan və s. Onları elə reklam etmişdilər ki, növbədən qəbullarına girmək mümkün deyildi. Bir nəfər tanıdığım adam orada əməliyyat olunmuşdu. Qayçını içində qoyub tikmişdilər. Çox pis vəziyyətdə Bakıya gətirəndə baxırlar ki, qayçı içindədir. Buna görə nə qədər teleqram vurdular, şikayət etdilər, heç baxan da olmadı. Bu, birinci hadisə deyildi. O vaxtlar mən eşitdim ki, bir həkim qocalıb ölürmüş, ağır vəziyyətdə vəsiyyət edib ki, mənə erməni xalq qəhrəmanı adı versinlər. Ona görə ki, mən başımın tükünün sayı qədər türk öldürmüşəm.

Yadınızda olarsa, Bakının “Neftçi” futbol komandasında Markarov adlı bir erməni futbolçu var idi. Onu da o həkim kimi reklam etmişdilər. Bir məsəl var: “erməni bic – müsəlman düz” (məsəlin sonuncu sözünü qəsdən dəyişdim, məni qınamayın). Nə bilək, biz ürəyi təmiz, qəlbi açıq bir xalqıq. İndi-indi başa düşmüşük ki, ermənilər içimizdə bizə tələ qururmuş. Mən o vaxt dəfələrlə “Neftçi”nin oyununa baxmışam. Markarov qapının ağzında durardı. Bizimkilər topla qapıya yaxınlaşanda stadionda hamı qışqırırdı: “Ver Markarova”. Hazır topu vurmağa nə var ki? Bakıda milyoner oldu, axırda İrəvana qaçıb getdi.

Sonra ermənilər Xankəndində adam öldürüblər, baş kəsiblər, maşında adamın üstünə benzin töküb odlayıblar. Nədənsə ölçü götürən, bir iş görən olmayıb. Yəni ki, məsələ aydındır. İndi mən o böyük dövlətləri qınamıram. Çünki biz ermənilərin məkrli siyasətini indi başa düşüb, yuxudan ayılmışıq. Onlar isə hələ fil qulağında yatırlar, başa düşəndə isə artıq gec olacaq. Anlamırlar ki, orada kök salan erməni lobbisi terrora dəstək məqsədilə həmin dövlətlərin bankına, büdcəsinə neçə milyardlarla ziyan vurublar. Orada məskən salan ermənilər yüksək vəzifəli şəxslərlə qohumlaşdığından hər şey örtbasdır edilir. Qoy etsinlər, bir vaxt gələcək onlar da bizim kimi bunun çox böyük zərərini görəcəklər.

Televiziyaları həmişə izləyirəm. Bəzi savadlı siyasətçilər də təəccüblərini gizlətmirlər. Ermənilərin böyük dövlətlər tərəfindən bu dərəcədə himayə edilməsinin haradan qaynaqlandığını araşdırmağa çalışırlar. Konkret cavab aydındır. Bunun səbəbi həmin qızlar, gəlinlər və yeznələrdir. Çünki onlar həmin dövlətlərdə yüksək vəzifə daşıyan imkanlı şəxslər, ixtiyar sahibləridirlər.

Üzümü ATƏT-in Minsk qrupunun həmsədri olan üç dövlətə tuturam: Sizdə dövlət konstitusiya ilə idarə edilir, yoxsa dövləti yeznələriniz, yaxud gəlinləriniz idarə edir? Yoxlaya bilərsiz, böyük vəzifəli şəxslərin, konqresmenlərin ya özləri ermənidir, ya qızlarınızla evlənən həmin oğlanlardır, ya da oğlanlarınız alan həmin erməni qızlarıdır. Onların hamısı həm də Ermənistan milli təhlükəsizlik orqanlarının agentləridir. Siz bu fakta əmin ola bilərsiniz. Və düşünün, görün belə vəziyyət sizlər üçün, millətiniz və dövlətiniz üçün nə deməkdir? Dərindən yoxlayıb tam inanacaqsınız ki, ermənilər həmişə hər yerdə bu cür alçaq siyasətlə məşğul olublar.

Bunlar Stalin dövründə çirkin, ikiüzlü siyasətləri ilə Kremli də aldadırdılar.

İkincisi, mən başa düşə bilmirəm, qoy siyasətçilər bu haqda düşünsün. Kütləvi informasiya vasitələrində tez-tez belə məlumatlarla rastlaşırıq: ermənilər acından qırılırlar, köçüb gedirlər, Ermənistanda cəmi iki milyona qədər əhali qalıb ki, onlar da uşaq və qocalardır. Biz ermənilərin qudurduğunu, Qarabağın sərvətini taladıqlarını demək əvəzinə, “məzlum xalq” olmalarına haqq qazandırırıq.

Təkcə Ağdamın, Füzulinin varı, Laçının, Kəlbəcərin yerüstü, yeraltı sərvətləri, mineral suları 2 milyon yox, 5 milyon ermənininin əlini bir işə vurmadan orada 100 il bəy kimi yaşamasına imkan verir. Əksinə, bizimkilər deyir ki, ermənilər qırılır, köçüb qaçır. Belə çıxır ki, onsuz da ermənilərin tərəfində olan dövlətlərə biz özümüz də tutarlı “fakt” veririk ki, onlara ayrılan yardımlarını daha da artırsınlar. Ermənilər bir müddət hay-haray qopardı ki, blokadada qalmışıq. Fakt budur ki, Naxçıvan o vaxtdan blokadaya alınıb. Hələ bir dəfə də olsun eşitməmişəm deyələr ki, Naxçıvan blokadadadır.

Beləliklə, çox qısa olaraq şahidi olduğum, bildiyim və eşitdiyim həqiqətləri sizə çatdırdım.

Son olaraq haqq sözümü, haqq səsimi ermənilərə də çatdırıram: siz bu çirkin, alçaq əməllərlə Qarabağı işğal edib, heç vaxt orada rahat yaşaya bilmərsiniz. Qarabağı alçaqlıqla işğal etmisiniz, biz isə torpaqlarımızı kişi kimi azad edəcəyik!

## DAĞLARIN

Göz dikiblər sərvətinə əzəldən,
Sinəsində yarası var dağların.
Boynu buruq bənövşəsi, nərgizi,
Bağrı qara laləsi var dağların.

Dillər əzbəridir adı, sorağı,
Qaçaqlar talası, qırğız yaylası.
Dünyanı mat qoyub İsa bulağı,
Şuşa kimi qalası var dağların.

Kirs dağıyla Sarıbaba qoşadı,
Hoçaz qayası da bir tamaşadı.
Orda mərhum şair İlyas yaşadı,
Ürəyimdə yuvası var dağların.

Köhnə kənd, Alıcan, Xumarta, İrçan,
Ədəb-ərkan məskənidir o cahan.
Qəlbimizdə yaşadırıq hər zaman,
Göz bulaqda aynası var dağların.

Dəstə dağ keçisi dağlar başında,
Seyrə çıxır baharında, qışında.
Qaqqıldaşır qayasında, daşında,
Kəkliyində xınası var dağların.

Ərdəşəvi, Şəlvə, Şamkənd obası,
Dağlara söykənib Qorçu zonası.
Qarabağım bir gözəllik dünyası,
Çiynində var al xarası dağların.

Keç bir Qızılcadan Mərkizə sarı,
Məğrur Ağoğlanı seyr eylə barı.
Əhmədliynən Minkənd cənnət diyarı,
Qaragöldə sonası var dağların.

Fəxr etmişəm obasıynan, eliynən,
Çəməniynən, çiçəyiynən, gülüynən.
Elə bil ki rəssam çəkib əliynən,
Düzümü var, sırası var dağların.

Can ay qərib məzar, ay qərib vətən!
Dərdimizi bilməz hər gəlib-gedən.
Ayrı düşüb bizdən səhər sübhəcən,
Ana kimi laylası var dağların.

Ay Vəzirxan, Xətailər dünyası,
Viran qala bilməz eli, obası.
Deyirlər boş qalmaz tərlan yuvası,
Qartalının balası var dağların.

## DEYİL

Qəlbində vətənçün bir alov yanır,
Ömrün sonunacan sönəsi deyil.
İndiyəcən ürəyimdə çəkdiyim
Dərdimi bir kimsə biləsi deyil.

Cavan, qoca, hamı köçün sürəcək,
Kimi ağlayacaq, kimi güləcək.
Yarananlar hamı ölüb gedəcək,
Şeytan, mərdimazar öləsi deyil.

Çox cəhd olub bu dünyada sərbəsər,
İsgəndər yerindən oldu dərbədər.
Gəlsə neçə milyon imam, peyğəmbər,
Dünyanın sirrini biləsi deyil.

Qaranlıq dünyanı etdilər səhər,
Üç kimsə ömrünü vermədi hədər.
Sultan bəy, Atatürk, Əliyev Heydər
Bir də bu dünyaya gələsi deyil.

Hər vaxt öz hökmünü verir bir zaman,
Həyat qanununa verilmir fərman.
Belə qoyulubdu gərdişi-dövran,
Gedən bir də geri dönəsi deyil.

Ay şair, ömrünü eyləmə hədər!
Həyat başdan-başa qüssə, qəm-kədər.
Bircə bu dünyanın sonuna qədər
Günəşin ziyası sönəsi deyil.

Hamı unudacaq imanı, dini,
Ərşə dirənəcək, amanı, ünü.
Vəzirxan, səninlə qiyamət günü
Bir kimsə tikəsin böləsi deyil.

## YADINA DÜŞÜRMÜ?

***Dostum Şahverdiyev Nizamiyə***

Necəsən, ay qardaş, dağlardan axan
Daşıb, coşan sel yadına düşürmü?
Fərq etməzdi yayda, qışda çimdiyin
"Qazan" adlı göl yadına düşürmü?

Mıxtökəndə fışqa çalan fır kəklik,
Quzuqulağı, yarpız, şöşanla yemlik.
Nərdivanda, Bejaxlıqda əvəlik,
Çiçəklidə gül yadına düşürmü?

Yeddi bölük, Qaranlığın dərəsi,
Uzun yal, Çalbayır, Dərəbinəsi.
Yüz yerə bölünüb Şəlvə dərəsi,
O vəfalı el yadına düşürmü?

Kəmərqaya, Yelli gədik yaylağı,
Qızılqaya mərd igidlər oylağı.
Arxud bulağında camış qaymağı,
Qovuşuqda bal yadına düşürmü?

Vəzirxanam, əziz dostum, sirdaşım,
Qocalmışam, zəifləyib yaddaşım.
Bu güldən yeddi rəng saydım, qardaşım,
Lalədəki xal yadına düşürmü?

***

Laçınım ulu qaldı,
Bağlandı yolu, qaldı.
Tükənməz sözüm mənim,
Bu sinəm dolu qaldı.

**Vəzirxan SÜLEYMANOV**

**MÜSAHİBƏ**

## "LAÇIN YADIMDA YAMYAŞIL QALIB"

***Müsahibimiz tanınmış jurnalist, İctimai Televiziya və Radio Yayımları Şirkətinin şöbə müdiri, "Müzakirə vaxtı", "Ortaq məxrəc" verilişlərinin müəllifi və aparıcısı Vəsilə Vahidqızıdır.***



**Qısa tanıtım:** *Zeynalova (Mahmudova) Vəsilə Vahid qızı 19 avqust 1967-ci ildə Laçın rayonunun Çorman kəndində anadan olub. BDU-nun jurnalistika fakültəsini fərqlənmə diplomu ilə bitirib.*

*1992-2002-ci illərdə AzTV, 2002-2003-cü illərdə "İnternyus-Azərbaycan" İctimai Birliyində, 2004-cü ildə "Space" TV-də çalışıb. Vəsilə Vahidqızı 2005-ci ildən – İctimai Televiziya fəaliyyətə başladığı ilk gündən bu telekanalda çalışıb. BBC və Yaponiyanın ictimai kanalı olan NHK-də təcrübə kursu keçib. BDU-nun dissertanturasında təhsil alıb.*

*Hazırda İctimai Televiziyada şöbə müdiridir, eyni zamanda "Ortaq məxrəc" və "Müzakirə vaxtı" verilişlərinin müəllifi və aparıcısıdır.*

*2010-cu ildə aparıcısı olduğu "Ortaq məxrəc" tok-şousu Ailə, Qadın və Uşaq Problemləri üzrə Dövlət Komitəsi, Heydər Əliyev Fondu və BMT-nin Əhali Fondunun birgə keçirdiyi "Azərbaycan ailəsi – 2010" kino festivalı müsabiqəsinin "Ən yaxşı televiziya proqramı" nominasiyasında qalib olub. Xarici ölkələrdən hazırladığı verilişlər və bir sıra sənədli filmlər İTV-nin qızıl fondundadır.*

*Elmi fəaliyyətlə məşğuldur və bu fəaliyyət BBC və TRT-nin təcrübəsi əsasında İctimai TV-nin reytinqinin yüksəldilməsi ilə bağlıdır.*

*Vəsilə Vahidqızı 2011-ci ildə İctimai Televiziyadakı fəaliyyətinə görə Azərbaycan Jurnalistlər Birliyinin Həsən bəy Zərdabi mükafatını alıb. Vəsilə Vahidqızı azad, məsuliyyətli və peşəkar jurnalist fəaliyyətinə görə dövlət və qeyri-hökumət təşkilatlarının, jurnalist birliklərinin onlarla diplom və mükafatına layiq görülüb.*

*2015-ci ildə Vəsilə Vahidqızı Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə ölkədə kütləvi informasiya vasitələrinin inkişafındakı xidmətlərinə görə "Tərəqqi" medalı ilə təltif edilib.*

*Jurnalist Hikmət Sabiroğlunun həyat yoldaşıdır. Bir oğlu var.*

**– Vəsilə xanım, ilk növbədə Sizi Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə ölkədə kütləvi informasiya vasitələrinin inkişafındakı xidmətlərinizə görə “Tərəqqi” medalına layiq görülməyiniz münasibətilə təbrik edirik. Bu mükafata layiq görülməyiniz demək olar ki, həm də uzun illərdir çalışdığınız İctimai Televiziya və Radio Yayımları Şirkətinin 10 illik yubileyi ilə eyni vaxta düşdü. Jurnalistlik fəaliyyətinizin ölkə başçısı səviyyəsində qiymətləndirilməsi və yubiley sevinci ilə bağlı təəssüratlarınızı oxucularımızla bölüşməyinizi istərdik.**

– Təbrikinizə cavab olaraq, əlbəttə, çox təşəkkür edirəm. Azərbaycan Prezidenti İlham Əliyevin sərəncamı ilə "Tərəqqi" medalına layiq görülməyim xəbərini xaricdə olarkən aldım. Belə bir təqdimatdan xəbərim belə olmamışdı. Medalı almaq üçün səfərimi yarımçıq qoyub geri döndüm. Mən televiziya sahəsində iş fəaliyyətinə 1992-ci ildə Azərbaycan Dövlət Televiziyasında başlamışam. Bakı Dövlət Universitetini həmin il fərqlənmə diplomu ilə bitirmişdim. Bu sahədə xeyli yol getmişəm və hər zaman da belə bir prinsipim olub – sən başını aşağı salıb işini gör, səni mütləq görəcəklər. Çox sevinirəm ki, məni və mənim fəaliyyətimi görən insan ölkənin birinci şəxsidir. Cənab Prezidentin sərəncamı ilə "Tərəqqi" medalı almaq işimə verilən ən böyük qiymətdir. Bunun üçün ölkə başçısı İlham Əliyevə minnətdaram.

O ki, qaldı İctimai yayımın 10 illiyi ilə bağlı təəssürata, bu yayım forması bütün dünyada başqalarından tamamilə fərqlənən, əsasən maarifçilik prinsiplərinə söykənən bir yayım formasıdır. Doğrudur, İctimai Televiziya və Radio Yayımları Şirkətinin yaşı çox kiçikdir. Amma prinsiplərinin oturuşması baxımından bəzi işlər görülüb.

İctimai yayım anlayışı XX əsrin 20-ci illərində Böyük Britaniyada, 50-ci illərində ABŞ-da, daha sonra – həmin yüzilliyin 70-ci illərində Avropada yaranıb və möhkəmlənib. İctimai TV-nin dünyada populyarlaşması isə Qərbi Avropada onun yaranmasından təxminən 10 il sonraya təsadüf edir. Mütəxəssislər ictimai yayımı belə xarakterizə edirlər – İctimai Televiziya ideoloji buxovlardan azad, tamaşaçıya gerçəklik haqqında dolğun informasiya verən, rəngarəng verilişlərlə tamaşaçının zövqünü oxşayan, dözümlülük təbliğ edən, mülayim səs ahəngi və qərəzsizliyi ilə seçilən yayım formasıdır.

10 illik zaman çərçivəsində Azərbaycan İctimai Televiziyası da içtimai yayımçılıq adına xeyli işlər görüb və prinsipləri qorumağa çalışıb.

Mən bu kanal yaranan gündən İTV-dəyəm və heç bir vaxt burada olduğumdan peşmançılıq çəkməmişəm.

**– Bütün müsahiblərimizə həmişə dəyişməyən bir sualımız olur. Ənənəmizə sadiq qalaraq o sualı sizə də ünvanlayırıq: – Bizə məlum olan rəsmi bioqrafiyanıza daha nələri əlavə edərdiniz? Oxuduğunuz orta məktəbin adı çəkilməyib. Əslində insan həyatının ən unudulmaz çağları məktəb illəridir. O illəri necə xatırlayırsız?**

– Mən Laçın rayonunun Çorman kəndində doğulmuşam və ilk təhsilimi də orada almışam. Amma sonra atamın işi ilə bağlı bir neçə məktəb dəyişməli olmuşam. Birinci sinfə getdiyim günlərin gözəl xatirələri var. Uşaqlar yadımdan çıxsa belə, dərsə hazırlaşmağım, başqa kənddən gələn müəllimi səbirsizliklə gözləməyimiz, geyimimizi həvəslə hazırlamağımız bugünkü kimi yadımdadır. Dünyanın harasına getsəm, ilk fikir verdiyim şey yaşıllıqdır, insanların təbiətə münasibətidir. Çormanın və bütövlükdə Laçının sıx meşələri üçün darıxıram. Yaşıl təpələr, sözün həqiqi mənasında al-əlvan çəmənliklər harada var ki? Laçının rəngbərəng gülləri, çiçəkləri belə yadıma düşür. Hər gün oralara getməyim gəlir, hər gün...



**– Səhv etmirəmsə, orta məktəbdə oxuyanda şeirləriniz mətbuatda dərc olunurdu. Bu ötəri hiss idi, yoxsa şairliyi jurnalistikaya qurban verdiniz?**

– Şeir mənim üçün bu gün çox uzaq bir şeydir. Uşaqlıq həvəsi imiş, keçib gedib. Amma şeir oxuyuram, xüsusilə də Ramiz Rövşənin şeirlərini. Az qala hər gün R.Rövşəndən nəsə oxuyuram. Bəxtiyar Vahabzadənin, Məmməd Arazın bəlkə də oxumadığım şeiri yoxdur. Amma Ramiz Rövşən mənim üçün bir başqadır. Daha gənc nəslin də şeirləri ilə maraqlanıram.

Mən uşaq olanda, daha doğrusu, orta məktəbin sonlarında, jurnalistikaya maraq göstərəndə jurnalistikanın ədəbiyyatdan fərqini ayırd edə bilmirdim.

Sonralar bunların iki fərqli sahə olduğunu başa düşdüm və jurnalistika mənim üçün önə keçdi.

**– Sonra isə ali məktəbə aparan yollar. Qaynar tələbəlik həyatı... Və bir gün, – nənələrimiz demiş, – şuşalı oğlan “saqqızınızı oğurladı”... Ye-**

**ri gəlmişkən, üç nəfərlik ailədə iki tanınmış jurnalist. Mübahisələr, müzakirələr hərdən umu-küsüyə çevrilmir ki?**

– Ali məktəbə aparan yollar... Bu dünyada ədalət olmalıdır, hamıya bərabər fürsətlər verilməli, bərabər imkanlar tanınmalıdır. Bütün bunları çox tez dərk etmişəm və düşünmüşəm ki, mübarizənin yolu jurnalistikadan, həqiqi söz uğrunda mübarizədən keçir. Bizim zamanımızda ali məktəbə daxil olmaq o qədər də asan deyildi, pulsuz və tapşırıqsız tələbə adı qazanmaq böyük zəhmət və az qala qəhrəmanlıq tələb edirdi. Gecə-gündüz çalışaraq dövrün qaydalarına qalib gələnlərdən oldum və Bakı Dövlət Universitetinin jurnalistika fakültəsini fərqlənmə diplomu ilə bitirdim. Tələbəlik illəri hamı kimi mənə də maraqlıydı, amma bizim dövrün fərqi də vardı. Biz milli azadlıq hərəkatı dövrünün gəncləri olduq, düşüncəmiz başqa cür formalaşdı, Vətən və millət anlayışımız az qala tam oldu. Biz SSRİ-nin dağılmasını və müasir Azərbaycanın doğuluşunu gördük. Eyni zamanda müharibə gəncləri olduq, 20 Yanvar faciəsini bağrımızda hiss etdik. 5 illik tələbəlik ömrünə nələr sığmadı ki... Böyük alimimiz Şirməmməd Hüseynovu dinlədik, Mirşahinlə, Sevinc Osmanqızı, M.Ə.Sabirin nəvəsi, hazırda ABŞ-da yaşayan Gündüz Tahirli ilə, Aynur Sofiyeva ilə eyni auditoriyaları paylaşdıq. Üstəgəl ailə həyatım da universitetdə tanıdığım şəxslə davam etdi.

İki jurnalistin bir evdə yaşamasına çox adi bir şey kimi baxıram. Müəyyən məsələlərlə bağlı fikir mübadiləsi olur, eyni xəbəri izləmə, eyni reaksiyanı vermə, dünyada baş verən prosesləri müxtəlif mənbələrdən dəqiqləşdirmə və s kimi üst-üstə düşən məsələlər var.

Amma mən evdə daha çox anayam. İşi evə daşıyanlardan deyiləm. İctimai-siyasi müzakirələr işdə və studiyada qalır. Evdə daha çox sakitlik axtarırıq.

**– Aparıcı Vəsilə Vahidqızı tamaşaçı Vəsilə Vahidqızına hesabat verirmi?**

– Hesabat məsələsi – bu sual xoşuma gəldi. Təkcə ona görə yox ki, özümə verilişlərimlə bağlı hər zaman hesabat verirəm – öz tamaşaçım kimi, həm də ona görə ki, ümumiyyətlə, hesabat verməyi, özünü təftiş etməyi bir mədəniyyət göstəricisi sayıram. İnsan mütləq kənardan özünə baxmalıdır və qiymətini verməli, islah olunmağı bacarmalıdır. Mümkün qədər verilişlərimə diqqətlə baxıram və bütün çatışmayan cəhətləri aradan qaldırmağa çalışıram. Nə qədər çətin şərtlər daxilində olsa da, bir jurnalist kimi özümü 10 il əvvəlkindən daha mükəmməl hesab edirəm. Məni olduqca ciddi şəkildə narahat edən məsələlərdən biri budur ki, insanlar çalışdıqları sahələri öyrənməyə meyil etmirlər. Mən günbəgün jurnalistika sahəsindəki yeni standart-

ları, trendləri mənimsəməyə çalışıram. Qərb televiziyalarını izləməyə üstünlük verirəm, onların problemə baxış bucaqlarını izləyirəm, yeni tendensiyaları mənimsəməyə çalışıram. Müasir standartları öyrənmək üçün, tətbiq etmək çətin olsa belə, kifayət qədər müasir ədəbiyyat var. Xüsusilə, dünyanın ən məşhur tok-şou aparıcısı amerikalı Opra Uinfrinin verilişlərini izləməyi bir ustad dərsi sayıram. Bəzən ABŞ televiziyalarından öyrəndiyim hansısa formanın tətbiqini bizim tamaşaçının çox da maraqla qarşılamadığını görürəm. Bu o demək deyil ki, tamaşaçı nə istəyirsə və necə istəyirsə elə işləməli, onun dediyini etməlisən. İctimai yayımçılığın xarakteri tələb edir ki, tamaşaçıya nə lazım olduğunu sən müəyyən edəsən, yəni telekanal olaraq onu təqdim edəsən. Bütün bunlar və digər bəzi mətləblər baxımından hesabatlılıq çox önəmlidir. Hesabatı verməlisən, özünütənqiddən qaçmamalısan və lazım olan bütün məqamlarda özünə yox deməyi bacarmalısan.



**– Feysbuk səhifəmizdə də Sizə maraqlı suallar ünvanlanıb. Təkcə sual verməklə kifayətlənməyən dostlarımız yeri gəldikcə arzu və istəklərini də bölüşüblər.**

– Sağ olsunlar, imkanım daxilində bütün sualları cavablandırmağa çalışacam.

**Əjdər Hümbət:** *– Laçın adı səslənəndə hansı hissləri keçirirsiz və Laçın sizin üçün nə deməkdir?*

– Laçın adı səslənəndə hər zaman ağlayıram. Sizinlə məmnuniyyətlə virtual söhbət edirəm, amma bilin ki, çox kədərliyəm, göz yaşımı tuta bilmirəm.

**Qəzənfər Hüseyn:** *– Vəsilə xanım üçün sual seçmək çox çətindir. Bizim adımızdan ona ailə xoşbəxtliyi, cansağlığı və yaradıcılıq uğurları arzularımızı çatdırmağı xahiş edirəm!*

**Şölə Məmmədli:** *– Siz özünüzdə bir çoxlarına qarşı laqeydlik duyursunuzmu? Yəni özünüzü laqeyd insan kimi hiss edirsinizmi?*

*İkinci sualım isə belədir: AzTV diktorlarından başqa bütün kanalların əksər diktor və aparıcıları ağız və üz mimikalarından, səs tonlarının əcaibliyindən istifadə edirlər. Düzü, İctimai kanalda bunu az diktorlarda görmüşəm. Onu da deyim ki, çox əcaib görünürlər və bunu nədən belə edirlər? AzTV əməkdaşları kimi adi və sadə danışa bilməzlərmi. Xüsusən ANS.*

– Birinci sualınıza cavab olaraq deyim ki, gücüm çatmayan işlərə qol qoymuram və heç vaxt insanlara boş yerə ümid vermirəm. İnsanların problemlərinin işıqlandırılması üçün əlimdən gələni və bəzən mümkün olandan artığını edirəm. Əslində çox şey kənardan göründüyündən qat-qat fərqlidir.

İkinci sualınız da maraqlıdır. AzTV-də həqiqətən diktorluq sistemi var, başqa televiziyalarda aparıcılıq sistemidir. İnsanlar bütün günü oturub başqalarının yazdıqlarını oxuyacaqları anı gözləmirlər, çox gərgin və ciddi rejimdə işləyirlər, xüsusilə ANS-də. Gərgin iş sizin qeyd etdiyiniz məsələnin bir səbəbi sayıla bilər. Əlbəttə, bunun tamaşaçıya dəxli yoxdur, o, nəticəni qiymətləndirir. Xarici kanallarda çox olmuşuq, orada çox adam yığışıb bir işi görür, bizdə az adam çox işin öhdəsindən gəlməlidir. Ona görə də keyfiyyət fərqini bu qədər hiss edirsiniz. TRT-də 3 saatlıq verilişdə işi yalnız ara-sıra bir düyməni basmaqdan ibarət olan bir işçi bizim əmək haqqımızın 3 qatını alır.

**Xuraman Camalqızı:** – *Vəsilə xanıma uğurlar arzulayıram!*

**Araz Yaquboğlu:** – *Vəsilə xanım, Siz bilirsinizmi ki, indiki zamanda teleaparıcıların tamaşaçıların zövqünü korladığı bir vaxtda bəlkə də ən yaxşı teleaparıcılardan birisiniz?*

– Ən yaxşı olmaq çox çətin məsələdir. Hər şey nisbidir. Sadəcə əxlaq qaydalarını və etik çərçivələri aşmamağa, kontrol cizgisini keçməməyə çalışıram.

**Fuad Nərimanlı:** – *Vəsilə Mahmudova ilə Vəsilə Vahidqızının fərqi...*

– Mahmudova soyadını az qala unutmuşam. Artıq neçə ildir ki, Zeynalovayam. Laçınlılar bizi Mahmudovlar kimi tanıyırlar. AzTV-də 10 il işləmişəm, oradan məni xatırlayanlar da Mahmudova deyir. Bunlar bir yana, sualınızın arxasında ciddi fəlsəfi məqamlar var və düşündürücü tərəfləri çoxdur. Harada olmağımdan asılı olmayaraq laçınlılığımı itirməməyə, unutmamağa çalışmışam, əli təmizlikdən, dürüst olmaqdan, mütəvazilikdən üstün bir şey tanımamışam, soyadların dəyişməsilə dəyərlərin dəyişməsinə imkan verməmişəm. Mənim işdə və şəxsi həyatda öz qaydalarım var, onları dəyişməyə heç bir amil təsir edə bilməz. Amma əlbəttə ki, illər insanın həyata baxışını formalaşdırır, təhsil səviyyəsini artırır, təcrübəsini zənginləş-

dirir. Hər şeydən əvvəl işimlə bağlı dünyanın ən uzaq, ən inkişaf etmiş ölkələrinə səfərlər etmişəm, minlərlə fərqli insanla ünsiyyətdə olmuşam, bunlar dünyagörüşü, həyata baxışı xeyli dəyişdirir. Yaş da öz işini görür. Və nəhayət, insan o qənaətə gəlir ki, bir çox daşlaşmış qaydaları nəzərə almasaq Mahmudova ilə Vahidqızının fərqi Laçınla Bakının fərqindən az deyil, ən azı məsafələr baxımından. Son olaraq biz əgər 20-25 il əvvəlki kimi olsaydıq, dəyişməsəydik, onda yaşamış da olmazdıq.

**Namiq Zaman:** – *Vəsilə xanım jurnalistikada kimi və ya kimləri özü üçün ideal hesab edir? Və bu peşəni seçdiyinə görə peşman deyil ki?*



– Jurnalistika hər şeydən əvvəl prinsiplərə əməl olunması sənətidir. Yaradıcılıq, istedad onu bəzəyir. Bu mənada orada ideal axtarmaq kimi bir niyyətim yoxdur və olmayıb da. Amma ümumi götürəndə böyük başarılara imza atan insanlar var ki, onları izləməmək və onlardan öyrənməmək mümkün deyil. Davamlı izlədiyim və ustad dərslərindən faydalandığım ABŞ teleməkanının əvəzolunmaz ismi Opra Uinfridir. Maykl Ceksondan sonra dünyanın ən varlı qaradərilisi olan Opra milyonlarını istedadı, zəhmətkeşliyi ilə qazanıb və illər, həm də şöhrət onun bir çox xüsusiyyətlərindən bir çınqıl belə qopara bilməyib. Yerli teleməkana gəldikdə isə mənə görə bütün illərin ən maraqlı jurnalisti Mirşahindir. Peşmançılıq sualına cavabım belədir: bu nəyi dəyişir ki?

**Xəqani Mirzəyev:** – *Azərbaycan jurnalistikası sizi qane edirmi?*

– Bu olduqca ümumi bir sualdır. Ümumi sualları cavablandırmaq asan olmur. Düşünürəm ki, fəal jurnalistikada peşəkarların sayının az olması Azərbaycan jurnalistikasında ciddi problemlər yaradıb. Vəziyyət heç də ürəkaçan deyil.

**Zamin Təhməzov:** – *I sinifdən IV sinfə kimi hansı kənddə oxumusunuz və sizinlə bir sinifdə hansı əlaçılar var idi?*

– Mən 1987-ci ildən Laçın rayonundan çıxmışam, o vaxt da, indi də laçınlılardan uzaqda yaşamışam. Və nəzərə alsaq ki, bir neçə məktəbdə oxumuşam, nəticə olaraq çox az sinif yoldaşımı xatırlayıram və buna hər zaman təəssüflənirəm. Dəfələrlə olub ki, laçınlıların məclislərində kimsə mənə yaxınlaşıb və məni tanımadınmı deyib, çox kədərlənmişəm və "xeyr" demişəm. Sizin dediyiniz şəxslər də o qisimdəndir. O illəri yada salanda bircə Qasım müəllim yadıma düşür.

**Əziz Əşrəfov:** *– Sizin Bozlu kəndi ilə bağlı hansı təəssüratlarınız var?*

– Uşaqlığımın bir hissəsi Bozlu ilə bağlıdır. Mehriban insanlar, gözəl bir kənd, oxumağa çox maraq göstərən şagirdlər... Çox şey.

**Mirkazım Laçın Alxaslı:** *– Laçın xatirələrinizdə necə qalıb?*

– Laçın yadımda yamyaşıl qalıb. Sözün hər mənasında.

**Zabil Məcnunov:** *–"İgidliyin zirvəsi" qısa metrajlı filmini çəkmək ideyası haradan yarandı və davamı olacaqmı?*

– Bu mənim yox, çoxlarının yaxşı tanıdığı, filmin qəhrəmanı Vaqif Quliyevin döyüş yoldaşı Güloğlan müəllimin təklifi olub və başqa laçınlı qəhrəmanlarla da bağlı sənədli filmlərin hazırlanması barədə söhbətimiz olub. Əslində bütün təşəkkürlər Güloğlan müəllimə düşür.

**Azər Yaşaroğlu:** *– "Cəsarətin qurtardığı yerdə həmişə əsarət başlayır" fikri ilə razısız?*

– Cəsarətin olmadığı yer ən dəhşətli yerdir. Orada hər şey başlaya bilər.

**Arif Mikayılov:** *– Vəsilə xanım, siz Laçının erməni işğalçılarından azad olunma xəbərini ilk öncə kimə çatdırmağa tələsərdiniz? İnşallah, o gün hökmən gələcək...*

– Kaş bizə bu xəbəri eşitmək qismət ola. İlk olaraq özümə çatdırardım bu xəbəri, var gücümlə qışqırardım, səsim Allaha gedib çatardı…

**Söhrab Həsənov:** *– Laçın televiziyası olsaydı, karyeranızı orada davam etdirərdinizmi?*

– Hər dəqiqənin öz hökmü var deyirlər. Bu an üçün sizə verəcəyim cavab belədir: hazırda mən Azərbaycanda ictimai yayımla bağlı ilk və tək doktorluq dissertasiyasının müəllifiyəm. İllər uzunu İTV-nin açılmasını gözləmişəm. Mütəxəssislər yaxşı bilir ki, bu tamamilə fərqli yayım formasıdır. Onun dünyadakı müxtəlif formalarını öyrənmək yolundayam. Hələlik işləmək istədiyim yer İctimai Televiziyadır. Amma günü sabah nə olacağını nə siz bilirsiniz, nə də mən...

**Orxan Cəbrayıl:** – *Üzvü olduğunuz "Laçın və laçınlılar" qrupunun fəaliyyəti sizi qane edirmi?*

– Əlbəttə. Bu da kiçik mənada lobbiçilik fəaliyyətidir. Mən nə qədər laçınlını bu qrup vasitəsilə tanımışam, unutduqlarımı burada xatırlamışam. Virtual əlaqə olmasa bir-birimizdən tamamilə qoparıq.

**Cabir Əvəzzadə:** – *İnsanın həyatında genetik xüsusiyyətlərin rolu nədir?*



– Fransız oğlan və qız evlənir, ailə qururlar. Məlumdur ki, fransızlar sarışındırlar. Amma onların uşağı zənci doğulur. Narazılıq başlayır və iş məhkəməyə gedib çıxır. Uzun tədqiqatdan sonra məlum olur ki, atanın ulu babası zənci olub. Gen özünü neçə nəsil sonra göstərib. Genetiklik hər zaman var – görüntüdə də, xasiyyətdə də.

**Dilafət Rəsulov:** – *Peşə əxlaqı, yüksək mədəniyyəti və etik davranışı ilə həmişə yaxşı mənada fərqlənən Vəsilə xanımın yetişdiyi mühitdən, valideynlərindən qısa da olsa bəhs etməsini istərdim.*

– Fikirləriniz üçün minnətdaram. Mən Laçında sadə bir ailədə doğulmuşam, həm də çoxuşaqlı bir ailədə. 4 qardaşım, 3 bacım var. Atam yeyintisənaye sahəsində işləyib, anam evdar qadın olub. İndi ikisi də təqaüdçüdür. Atamın yaşı 70-i ötməsinə baxmayaraq, indi də yüngül bir işdə çalışır. İşsiz qala bilmir və onu saxlayan, yaşadan məşğuliyyətdir. Oxumağa, təhsilə çox meyil göstərmişik. Ailəmizdə indiki nəsillərin qəbul etmədiyi sərt qaydalar olub – ailə quran qız geri qayıda bilməz, ənənələr pozula bilməz. Qardaşımın ikisi müharibə veteranıdır. Bizim qədər mehriban, bir-birinə əl tutan, tikəsini yarı bölməyi bacaran bacı-qardaş hər zaman tapıla bilməz. Xaraktercə yetişməyimə təsir edən mühit deyəndə BDU-nun jurnalistika fakültəsini, professor Şirməmməd Hüseynovun tövsiyələrini və ümumiyyətlə, milli azadlıq hərəkatı dövrünü xatırlamalıyam. O dövrdən və o adamlardan əxlaqlı olmağı, yaltaqlıqdan uzaq durmağı öyrənməyə çalışırdıq. Jurnalistika fakültəsi yeganə yerlərdən idi ki, orada kimsə səndən oxuduğun 5 il ərzində bir manat belə tələb etmirdi və tapşırıqsız-filansız mənim kimi fərqlənmə diplomu almaq mümkün idi. Yəqin elə bu gün də elədir.

Valideynlərimdən, ailəmdən söz düşmüşkən, bir xanım mənə mesaj yazıb ki, ailəmlə və harada yaşadığımla bağlı soruşmaq istəyir, amma sualını burada (feysbukda) yazmır. Mən isə burada cavab verəcəm. 1993-cü ildə ailə həyatı qurmuşam, həyat yoldaşım Hikmət Sabiroğlu tanınmış jurnalistdir. İlk övladımız yalnız 5 gün yaşadı. İkinci oğlumuz hazırda Neft Akademiyasının, indiki Neft və Sənaye Universitetinin III kurs tələbəsidir. Deməк 3 nəfərlik bir ailəmiz var. Yoldaşım şuşalıdır, məşhur bir nəslin nümayəndəsidir. Son 3 ilə qədər şəhərin mərkəzinə yaxın bir yerdə yaşayırdıq, hazırda 4-cü mikrorayondayıq. İkimizin də iş yerinə yaxın bir yerdə evimiz var.



**Zöhrab Məmmədov:** – *Sizə işinizdə uğurlar, Laçınlı və Şuşalı günlər arzulayıram!*

**Cahid Kərimli:** – *Laçınlıların suallarına cavab verdiyiniz üçün sağ olun.*

**– Vəsilə xanım, insan bəzən daxili dialoqa ehtiyac duyur, hansısa suallara cavab axtarır. Gözlədiyiniz elə bir sual olubmu ki, heç kəs sizə ünvanlamasın? Belə bir sual varmı? O suala cavabınız necə olardı?**

– Daxili dialoqlar və gözlədiyimiz suallar... Onlar çap üçün deyil ki... Hər mətləbi açıb danışsaydıq və ya daha dəqiqi açıb danışa bilsəydik nə vardı ki?

**– Sizinlə söhbətimiz Milli Məclisə seçkilərə start verildiyi vaxta düşdü. Deputatlığa namizədliyini irəli sürən şəxslərdə hansı keyfiyyətləri vacib hesab edirsiniz? Laçından seçiləcək deputatı necə görmək istərdiniz?**

– Millət vəkili olacaq insanların birinci təhsili, ixtisası məni maraqlandırır. Cümhuriyyət tarixinə baxın, o zaman millət vəkili olan insanların sırasında kimlər vardı. Hansısa müğənni, iş adamı, aktyor və s əvəzinə hüquqşünaslar, iqtisadçılar və tarixçilər Milli Məclisdə əyləşməlidir. Qanunu qəbul edən şəxs onun nə demək olduğunu bilməlidir. Millət vəkilinin vəzifəsi xeyriyyəçilik və s deyil. O ki qaldı Laçının millət vəkilinə, əslində mənim o şəxsdən nəsə gözləmək və tələb etmək kimi bir hüququm yoxdur. Mən uzun illərdir ki, Laçın qeydiyyatında deyiləm. Amma əlbəttə ki, savadlı və dürüst bir şəxsin millət vəkili olmasını arzu edərdim.

**Arif MƏMMƏDLİ**

**POEZİYA**



**Elman ELSEVƏR**

## BU YAZ

Qışa, qapı kimi
qapanıb gecə.
Yaza pəncərətək açılıb səhər –
ürəyi isidir ılıq şəfəqlər.
Üşüdür üzü
sübh ayazı.
Alçalar çiçəklənib.
Göyərib dodaqları
çılpaq budaqların.
Gilas dəyənədək...
tut yetişincə
söz-söz geyindir əyniyuxa
tifilləri –
gülsün gözləri.
Əlini burax,
yıxıla-dura,
misra-misra
qaçıb oynasın özləri.
Tutun dəyməsinə ta nə qalıb ki...

## ÜZ BALLADASI

*Fraqmentlər*

1.
Ora bax, suya tullandı,
ayaq üzdü, əl üzmədi.
Əl qalxdı, oyun göstərdi,
ayaq əldən əl üzmədi.

2.
Yolu yolumu kəsib,
qolu qolumu kəsib.
Sağı sağımdan keçir,
solu solumu kəsib;
Sözüm gözündən su içdi,
gözüm özündən su içmədi.
duyğumun göydə keçdiyi
o çaydan fikrim keçmədi...

3.
O üzün üzü bəridi,
o üzün o üzü yoxdu.
Bu üz o üzün biridi,
bundan özgə üzü yoxdu.

O üz bu üzün min dağı,
kim deyir ki, düzü yoxdu.
Bir düzün min çökəyi var,
min çökəyin düzü yoxdu.

Dənizində kimlər üzdü,
dib dərindi, yoxsa üzdü.
Yenədəmi üzhaüzdü,
su nə ilə üzbəüzdü,
suyun bərkdə üzü yoxdu.

O üzün üzü bəridi,
o üzün o üzü yoxdu.

## YAZ NAĞILI

*"Gün dastanı" silsiləsindən*

Yaz ötüşdü...
Yay yetişdi –
yetişib, qızardı günlər.
Öncə belə qızarmazdı,
aramla qızardı günlər.

Ta Gün gündən gündə keçir,
günlərimiz gündə keçir.
Çox gün uşaq ürəklərdən,
əlcə bişmiş kündə keçir.

Ta gün-gündən gün də keçir,
ta gün-gündən Gün də keçir.

Sevir, sevir doymur – səni,
günün keçir səndə günü.
Nə sirdirsə, sevib-sevib
doyammırsan sən də günü.

Axın-axın, nəsil-nəsil
Gün vurduqca qaralırsan.
Göydən od ələyir fəsil,
sənsə Gündən qaralırsan.

Qışdan çıxdın... Yay yetişdi,
Qışda donan yayda bişdi.
Göyə baxdım, alma yoxdu,
qıpqırmızı üç gün düşdü.
Biri mənim...

## AĞ ƏSKİNİ GÖTÜRƏKMİ

Dözəmmirəm göz yaşına.
Zəhləm gedir ağlamaqdan,
qızıl dişli gülməkdən də;
Bezikəndə yer üstündən
yer altıyçün ölməkdən də.

Yaşıl-yaşıl yarpaqların
xəzəl-xəzəl ağ tüstünsə...
Yaşayıb –
ölməkdən, anam,
ölüb –
yaşamaq üstünsə,
ağ zirvədə dalğalanan
ağ əskini...

Dözəmmirəm göz yaşına,
İyrənirəm ağlamaqdan,
gündə yüz yol ölməkdən də.

## ÖZÜNƏ YAZIĞIN GƏLSİN

Başın nəyə baş işlədir,
qulaqların baş işlədir.
Gözünə yazığın gəlsin.

Ağıza gəlmir-gəlməsin,
kağıza gəlmir, gəlməsin
sözünə yazığın gəlsin.

Mini qovan sənə dəymir –
ayaqların yerə dəymir.
İzinə yazığın gəlsin.

Meydanda qoydun kimisə...
için də başın kimisə,
özünə yazığın gəlsin.

## GÜN DASTANI

İlin həmin vədəsidi –
həmin aydı, həmin gündü.
O axşamın gecəsidi,
həmin sahil, həmin bağdı.
Amma bu Ay O Ay deyil,
O Ay azca bundan ağdı.

Heç ay da həmin ay deyil,
ta gün də həmin gün deyil.
Bu gün elə həmin Gündü,
amma bu gün, o gün deyil,
ilin həmin vədəsidi –
həmin aydı,
həmin gündü.
O axşamın gecəsidi.

Günlər vardı: qışda yaydı.
Günlər vardır: yayda qışdı.
İllər quşdu.
Günlər yaman bədəsildi.

**TAPANDA TAPIR ADAMI**

Nə qədər qaçsa da,
quş olub uçsa da,
lap belə, qoç oğlu qoçsa da –
qəza – qədər
tapanda tapır adamı.
Yol keçəndə, uçaqda, maşında,
iş başında tapır, qapır adamı.
Üçünü belindən tutur, beşini dilindən,
yüzünü nədənsə,
birinin də əlindən;
Nə kəlmə kəsir, nə söz dinləyir,
minini də –
silkələyib yeri,
tut kimi dənləyir.
Gizlənə-gizlənə gəlir,
gəlişini sezmək olur,
önünə daş düzmək olmur.
Üyüdür gizli-gizli,
həzin-həzin, sızıl-sızıl yoğurur,
yayıb göyür-göyür,
kündə-kündə təndirə yapır adamı.
Küt gedənin yanğısına dözmək olmur.
Lap belə, qoç oğlu qoçsa da,
quş olub uçsa da,
qaçsa da nə qədər –
tapanda tapır adamı qəza – qədər.

**SÖYÜDÜM**

Meyvələrin ağudurmu,
nəğmələrin ağıdırmı,
həyatın pis yuxudurmu,
danışdırsam söylərsənmi?

Gətir darayım saçını,
at getsin ağrı-acını.
Axtardığın əlacını
tapsan mənnən bölərsənmi?

Baxışı miskin söyüdüm,
taleyi çiskin söyüdüm.
Tanrıdan küskün söyüdüm,
sevgi nədir, bilirsənmi?

Başına işıq ələsəm,
ağappaq nura bələsəm...
Yuxuya qonaq eləsəm,
uyuyub dincələrsənmi?

Dözümü dəmir gözəlim,
sinəsi kömür gözəlim.
Uzandı ömür... gözəlim,
ölsəm, sən də ölərsənmi?

Ağrıdan süzülən nigar,
kirpikdən üzülən nigar,
misraya düzülən nigar,
məndən sevinc dilərsənmi?

Tilsimi daşlara çaxsam,
qara divi yerə yıxsam,
gəbərdib ayağa qalxsam,
gülsəm, sən də gülərsənmi?

## DAĞLARDA QIŞDIR

*Məmməd Araza*

"Əriməz" – ağ qılınc,
Bulud – bəyaz qın.
"İsti su" – Minkəndin isti göz yaşı.
Qaragöl Göygölə Xəzərdən yaxın,
Murov Salvartının doğma qardaşı.

Kəfənə bürünüb gədiklər, gözlər,
boz yük ulasları yerə əyibdir.
İnləyir qar altda cığırlar, izlər,
qasırğa kəndləri ütüləyibdir.

Ağzına su alıb susur Gen dərə,
sırsıra "Şivliyi" naxışlayıbdır.
Yaralı, örtüksüz pəncərələrə
şaxta tül pərdələr bağışlayıbdır.

Bakıda soyuğa dözməyə nə var,
buludlar Laçında yaman dəlidir.
Gördüyün sərkərdə, igid qayalar
sönmüş vulkanların daş heykəlidir.

Vurub qoltuğuna boz goreşəni,
Yamacda sülənir şimal ayısı.
Niyə ilanlığın başına vurmur,
nəyi gözləyirsən İlan qayası?!

Düşüb çəhliminə yağı əliyin,
Qırxqız meşəsində ona tuş oldu...
Qırmızı palıdlar, göylərə deyin: –
bu nə uzun çəkən soyuq qış oldu!

Qatıb qabağına sürü dumanı,
dərin dərələrdə otarır külək.
Quzeyin güneyə gəlir gümanı...
quzeydə bənövşə bitəydi gərək.

Bulanır gözündə varlar, varlıqlar,
inamı üşüyür sal buzun üstə.
Boz torda çırpınır qızıl balıqlar,
Həkəri yüyürür Arazın üstə.

Zirvə – gümüş xəncər,
bulud – bəyaz qın,
bulaqlar dağların büllur göz yaşı.
Təpələr dağlara düzlərdən yaxın,
dağlar təpələrin böyük qardaşı.

## BU PAYIZ

Qumral quzu toğlu oldu,
Abdullanın oğlu oldu.
Qonaq-qara çoxlu oldu –
Yazıq toğlu!

Sarı buzov cöngə oldu,
yol buruldu döngə oldu.
Sona bibim Gülxaranın
gəlininə yengə oldu –
Yazıq cöngə!

Badam, püstə ləpələnib,
üstə kişmiş səpələnib.
Buynuzlu baş təpələnib –
dörd yan dəri!

Həmzə bəyin ad günüdür,
gecələrin şad günüdür.
Bu gün ləzzət, dad günüdür,
düşünən yoxdur səhəri.

Doğrayırlar tikələri,
Parça-parça, iri-iri –
Yazıq naxır, yazıq sürü!

## BAZAR İQTİSADİYYATI

*Ələkbər Salahzadənin xatirəsinə*

“Biçənəkdəki otlar –
Tər, yaşıl, çiçək təki otlar!”

1
Cənab Adam Smit!
O qitə-qitə ərazi,
bu daş, o tərəzi:
çəkən qırtar, qırtar çəkər.
Tərifləyib mətahını
reklam-reklam, boğazını yırtar, çəkər.

...Susuzluqdan sızlar ürək –
adamı suya çəkər.
Üz tutar Tanrıya Adam...
ürəyini suya çəkər.

2
Hər şey nöqtədən başlanır
hər şeyin ilki nöqtədir.
Hər şeyin ilki nöqtəsə
ilkin öncəsi bəs nədir?

Daş dövründən öncədirmi
haqq dünyanın sınaq qolu;
Ömür –
ruhun yaranışdan
haqq dünyaya gedən yolu?

Ölmək üçün yaşamaz ki
yaşamaqçün ölən Adam.
Yuyub nəfsini, kinini
hirsinə güc gələn Adam.

3
...Su kimi içməzdi sözü,
ot təki biçməzdi sözü.
Dilinə “göz olardı”,
ölçməmiş biçməzdi sözü...

Bazar ki, var, o bazarda
çəkən qırtır, qırtır çəkir.
Hiyləsini
düz
Adamın –
düz adamın
kürəyindən yortur-çəkir.

Kiminləsə nə dostluğu,
nə qərəzi –
bu daş,
o tərəzi:
Çəkən qırtır...

*26 yanvar 2014*

**QƏHRƏMANLAR UNUDULMUR**



## “VƏTƏNİMİN YARASI SAĞALANDA MƏNİM DƏ YARALARIM SAĞALACAQ”

Bölük Qızartı zirvəsinə doğru irəliləyirdi. Elə bu vaxt hiyləgər düşmən artilleriya ilə bütün cinahları vurmağa çalışdı. Əsgərlərimiz güllə yağışı altında irəliləyə bilmədilər. Geri çəkilmək olduqca çətin idi. Müqavimət göstərmək isə daha acı nəticələr verə bilərdi. Çünki əsgərlərimizin mövqeyi ovuc içi kimi görünürdü. Bölük müvəqqəti sığınacaq axtarışında ikən tibb işçilərindən biri ağır yaralandı. Onu təhlükəsiz yerə çəkmək mümkün deyildi. Göydən alov yağırdı. Mühasirə halqası getdikcə daralırdı. Vəziyyətin gərginliyini nəzərə alan komandir qərargahla əlaqə yaradaraq, Əhməd Mehbalıyevi köməyə çağırdı. Əhməd bir göz qırpımında tankı ilə özünü yetirdi. Heç vaxt boşa getməyən sərrast atəşlə düşmənin hədəflərini susdura bildi. Tankın nərəsi və hədəflərin düzgün vurulması quldur dəstələrini pərən-pərən saldı. Bölük mühasirədən qurtuldu. Elə həmin gündən Əhmədin cəsarəti dillərə düşdü.



*Əhməd Şərur rayonunun Qıvraq kəndində dünyaya göz açıb. İdmana olan marağı onu dəfələrlə boks yarışlarının qalibi edib. Vətənə bağlılığı isə torpağa sevgisindən yaranıb, axı Mehbalı babası da torpaq uğrunda savaşlarda canından keçmişdi. Elə bu yurdsevərliyin nəticəsi idi ki, kənddə yerləşən hərbi hissəyə tez-tez baş çəkər, əsgərlərlə söhbət edərdi. O, artıq 7-ci sinfi bitirəndə son qərarını verdi: “Mən hərbçi olacağam, torpaqlarımızı yadellilərdən qorumaq üçün əlimdən gələni əsirgəməyəcəyəm”.*

Və bu müqəddəs istək onu Bakıya – Cəmşid Naxçıvanski adına Hərbi məktəbə gətirdi. Təhsil ocağını əla qiymətlərlə bitirən Əhməd 1985-ci ildə Kazan Tank Komandir-

ləri məktəbinin müdavimi oldu. Arzularına doğru inamla addımlayan soydaşımız 4 ildən sonra Kiyev Hərbi Diviziyasında zabit kimi fəaliyyətə başladı. Daha sonra xidmətini Moskva Hərbi dairəsində davam etdirdi.

Qarabağda qanlı olaylar baş verəndə Əhməd Mehbalıyev Vətənin harayına yetişdi. O zaman peşəkar zabitlərə ehtiyac vardı. Yeni yaranmaqda olan ordu müəyyən qüvvələr tərəfindən idarə olunurdu. Ölkəni xaosa sürükləyən İmperiyapərəst qüvvələrin başı kresloya o qədər qarışmışdı ki, nə ordu yada düşürdü, nə də qara bəxtli Qarabağın taleyi. Fürsətdən istifadə edən erməni quldurları yeni-yeni əraziləri işğal etməyə çalışırdılar.

Belə bir çətin şəraitdə Əhməd Mehbalıyev dağların bağrını yaran tankı ilə qaynar nöqtəyə – Şuşaya yollandı. Pirəküşküldə təlim keçdiyi əsgərlər də onunla birgə idilər. Şəhərdəki vəziyyət acınacaqlı olduğu qədər də, vahimə yaradırdı. Çünki silah-sursat qıtlığı vardı. Ağır texnikalar nasaz vəziyyətdə idi. Sanki qəsdən bu vəziyyət yaradılmışdı. Bölüklər arasındakı ziddiyyət düşmənin qol-qanadını açırdı.

Elə bu məqamda həyəcan təbili çalındı. Daşaltı istiqamətindən – daha doğrusu, Böyük Kirs dağından şəhərin mərkəzi atəşə tutuldu. Gənc komandir düşmənin atəş nöqtəsini təyin edən kimi hədəfə aldı. Artıq quldurların tankı susmuşdu. Qara tüstü meşəni öz rənginə boyamaqda idi. Mehbalıyevin ilk atəşi ilə susan düşmən Şuşada yeni bir nişançının peyda olduğunu anladı.

Qubadlı və Laçın istiqamətində şiddətlənən döyüşlərdə kapitan Əhməd Mehbalıyev kimi peşəkar tankçılara ehtiyac duyulurdu. Komandanlığın əmri ilə həmin istiqamətə yollanan gənc kapitan Qızartı, Susuzdağ yüksəklikləri, eləcə də, Mazutlu, Fərəcan yaşayış məntəqələri uğrunda savaşa atıldı.

Qızartı yüksəkliyini geri qaytarmaq üçün plan qurulmuşdu. Amma düşmən PDM-ləri irəliləməyə imkan vermirdi. Bu ağır yükü Əhməd öz boynuna götürdü. Dar yollara sığmayan nəhəng tank peşəkar əlində şahə qalxırdı sanki. “Dəmir at”ın kişnərtisi dağları lərzəyə gətirmişdi. Bölük zirvəyə doğru irəliləyirdi. Əhməd gözlənilən hücumun qarşısını almaq üçün PDM-lərin yerini təyin etməyə çalışdı. Elə bu an açılan atəş Əhmədin tankını silkələdi. Özünü itirməyən peşəkar tankçı eyni anda düşmən PDM-ni hədəfə aldı. İlk atəşdən alovlanan PDM ekipaj üzvləri ilə birlikdə yanıb külə döndü. Vəziyyətin gərginliyini görən digər PDM geri dönməyə məcbur oldu.

Əhmədin üzü yanmışdı, düşmənin açdığı atəşin yaratdığı istilik qarsımışıdı onun yanağını, gözləri qızarmışdı, bir qədər də ağrısı vardı. Ancaq yenə də tanka əyləşib düşmən hədəflərini vurmağa çalışdı. TŞK-nın nərəsi qulaq batırırdı.

Həmin gün Əhməd yolları aça bildi. Bölük sürətlə yüksəkliyə doğru irəlilədi. Bu dəfə isə əsgərlərimiz müxtəlif istiqamətdən top və qrad atəşinə tutuldu. Ancaq Əhməd quldurları susdurmağı bacardı.

Üzündəki yanığa görə hospitala getməkdən imtina etdi, "çox da dərinə getməyin, dağların yeli sağaldacaq" – deyib başı qarlı zirvələrə sarı boylandı.

Güləbirddə vəziyyət xeyli ağırlaşmışdı. Düşmən basqınlarının ardı-arası kəsilmirdi. Postlarda canlı qüvvə qıtlığı vardı. Binokllardan, gecəgörmə cihazlarından istifadə edən düşmən lazımi məlumatları əldə etdikdən sonra genişmiqyaslı əməliyyata hazırlaşırdı, daha doğrusu, quldurların budəfəki hücumu Güləbirdin zəbtinə hesablanmışdı. Odur ki, Əhməd Mehbalıyev daxil olmaqla, Güləbirdə tərəf irəliləyən dəstə vaxtında mövqe seçə bilmişdi.




Əhmədin ilk hədəfi quldurları qorxuya saldı. Digər tankçılar da ona dəstək oldular. Xeyli itki verən erməni bölüyü döyüşə başlamamış, iki tank və bir PDM itirərək geri çəkilməyə məcbur oldu. O gün Həkəri çayı quldurların leşinə şahidlik etdi və axıdılan murdar qanı yumağa çalışdı.

Gəyən düzün istiqamətində də döyüşlər şiddətlənmişdi. Cəbrayılın Sirik məntəqəsi quldurların amansız hücumlarına qarşı kifayət qədər müqavimət göstərsə də, düşmən geri çəkilmirdi. Yenə də cəsur tankçı sinəsini qabağa verdi. Kəndin ətrafında cəmləşən quldur dəstələrini darmadağın etmək üçün hədəfləri müəyyən etməyə çalışdı. Qısa zamanda baş tutan qarşıdurmada Əhməd düşmənin xeyli canlı qüvvəsini, silah-sursatı və bir PDM-ni sıradan çıxartdı.

Onun bir adəti vardı. Döyüş başa çatandan sonra tankdan aşağa enib xəfif-xəfif gülümsünürdü: "Hə, necədi, xoşunuza gəldi? Tankçının vəzifəsi vurub dağıtmaqdı, mən də dağıtdım".

Sirik döyüşündən bir gün sonra kəşfiyyatçılarımız məlumat gətirdi ki, qarşıdakı yüksəklikdən ermənilərin ərzaq və silah-sursat dolu yük maşınları keçəcək. Əhməd məlumatı bir daha dəqiqləşdirəndən sonra, lazımi mövqeyə çəkilib yolu hədəfə aldı.

– Budur, gəlir, birini də salamat buraxmayacağam, – deyib düyməni basdı. Qarşıdakı yük maşını alova büründü. Haray-qışqırıq seyrək meşənin səs-küyünə qarışdı. Göylərə yüksələn qara tüstü iniltini, ah-naləni boğmağa

çalışırdı sanki. Həmin gün yük maşınlarından bir neçəsi salamat qurtulsa da, xeyli ölən və yaralananlar oldu.

Maqsudlu – Güləbird istiqamətində baş verəcək döyüşdə üç dost – üç peşəkar tankçı iştirak edəcəkdi. Əvvəlcədən hədəflər müəyyən edilmiş, lazımi tədbirlər görülmüşdü. Plana əsasən, düşmən mühasirəyə salındıqdan sonra, üç istiqamətdən darmadağın edilməli, quldurlar tutduğu mövqedən geri oturdulmalı idi. Bir tərəfdən Əlövsət Vəliyev, ikinci tərəfdən İmran Allahverdiyev, digər tərəfdən isə Əhməd Mehbalıyev düşmənin başına od ələdi. Güllə yağışı altında özlərini itirən quldurlar dəmir mancanaqdan qurtula bilməyəcəklərini duyub geri çəkilməyə məcbur oldular. Amma tankçıların sayıqlığı nəticəsində qaçan silahlılar da hədəfə alındı. Qan su yerinə axdı o gün. Maqsudlu dərəsində qan gölməçələri yaranmışdı. Deyilənə görə, yağan yağış da qan gölünü yuyub apara bilmirdi. Bu döyüş quldurların yaddaşından silinməyən bir tarix yazdı.

Dostlar çox məmnun görünürdü.

***

Bir qədər sonra Əhməd Mehbalıyev Ağdama yollandı.

Əhməd sıravi əsgər kimi hər zaman odun-alovun içinə atırdı özünü. Dəfələrlə çıxılmaz vəziyyətdə qalan taqımı səriştəsi və bacarığı hesabına itkisiz xilas eləmişdi. Heç vaxt özünü gözləmirdi.

Allahverdi Bağırov (Milli Qəhrəman) ilk dəfə idi görüşürdü gənc tankçı ilə. Onun Şuşa, Laçın, Qubadlı döyüşlərində göstərdiyi şücaət haqqında çox eşitmişdi. Qorxmaz, cəsur ürəyə malik olduğunu yaxşı bilirdi. Əhmədi bağrına basdı:

“Sənin kimi oğullar bizə çox lazımdır, özünü qoru, Əhməd. Bir də deyəsən, yaralısan axı, kürəyin…” – demək istəsə də, Əhməd onun sözünü yarımçıq kəsdi.

– Narahat olmağa dəyməz, çoxdanın yarasıdır. Şuşa döyüşlərində almışdım.

– Yox, Əhməd, bu ki, təzə yaradır?

– O da ötüb keçər, eybi yox – gülümsündü.

Əhməd üçüncü dəfə idi ki, ayrı-ayrı vaxtlarda eyni yerdən yaralanırdı. Amma bircə dəfə də yaralı olduğunu kiməsə bildirməmişdi. Ağrılarını içinə çəkə-çəkə dözüb tablaşmışdı.

Allahverdi Bağırov həkim çağırsa da, Əhməd israrla “yox” dedi. Müalicəyə ehtiyacı olmadığını bildirdi. Elə bu vaxt daxil olan məlumat Əhmədi həkimin əlindən qurtardı, sanki şir tələni parçalayıb çıxdı. Düşmən ağır texnikanın köməyi ilə Əsgərandan Şelliyə doğru irəliləyirdi. Bağırov UAZ-a mindi, Mehbalıyev də onu tək buraxmadı.

Allahverdi etirazını bildirdi:

– Əhməd, sənin yaran hələ sağalmayıb, özü də dərindir.

– Mənim yaram Vətənin yarası sağalanda sağalacaq, – dedi Əhməd. Bir də yaxşı ki, hələ ayağımdakı yaranı görmədiniz. Yoxsa əl-qolumu bağlayıb yıxardınız palataya. Amma indi mübahisə yeri deyil, düşmən irəliləyir.

Nəhayət, UAZ döyüş xəttinə yaxınlaşdı. Bir qədər aralıda "kölgələnən" tank Əhmədin gözündən yayınmadı. Milli Ordu əsgərləri arasından tanıdığı üç nəfərlə tanka yaxınlaşdı.

– Bir saatdan sonra düşməni yarıb arxa mövqeyinə keçəcəyik, hələ onlar Əhmədin zərbəsini dadmayıblar, – deyib nəhəng tırtılı hərəkətə gətirdi. Bir tərəfdən piyada qoşun, digər tərəfdən Əhmədin sərrast atəşi düşmən tanklarını, canlı qüvvəsini sıradan çıxartmaqda idi. Nəhayət, arasıkəsilməz zərbələr quldurları geri dönməyə məcbur etdi.

Əhməd daha da irəliyə şığıyır, pərakəndə düşən quldurları qova-qova birbir hədəfə alırdı. Hətta döyüş xəttini keçdiyinin fərqində deyildi. Artıq düşmən postları geridə qalmışdı. Və birdən… və birdən ekipaj üzvləri ən qorxunc hadisə ilə üz-üzə qaldı. Düşməni lərzəyə salan tankın motoru söndü. Əhməd ha çalışdı hərəkətə gətirə bilmədi. Quldurların əlinə fürsət düşdü. Pulemyotlar, avtomatlar Əhmədə sarı tuşlandı. Atışma xeyli şiddətləndi. Sursat sürətlə tükənirdi. Ekipaj üzvlərindən biri də ağır yara almışdı. Mühasirə daralmaqda idi. İmkan varkən aradan çıxmağa çalışdılar. Əhmədin peşəkarlığı yenə də onların köməyinə çatdı. Çətinliklə də olsa, quldurların arasından sivişib çıxa bildilər. Artıq atışma səngimişdi. Amma Əhmədin narahatlığı getdikcə artırdı. Elə hey… düşmən tərəfə boylanır, öz-özünə nəsə deyinirdi. Tankın itirilməsi də ağır bir dərd olmuşdu ona. Peşəkar tankçı olsa da, motorun qəfləti sönməsi onun üçün hələ də müəmma olaraq qalırdı. Nələrin baş verdiyindən xəbərsiz halda vurnuxur, düşündüklərinin həqiqət olacağına inana bilmirdi. Daha doğrusu, inanmaq istəmirdi. Deyəsən, elə düşündüyü kimi idi.

– Aha, tapdım, budur, motorun yağıdır, bəs necə axa bilər? Deməli, satqınlar, alçaqlar, şərəfsizlər əvvəlcədən motora əl gəzdiriblər. Yağ axıb qurtardıqdan sonra da motor sönüb. Satqınların olduğunu eşitsəm də inanmazdım. Tfu sizə, biqeyrətlər. Heç bilirsinizmi bir tankın nə qədər qiyməti var, onu düşmənə necə bağışlaya bildiniz. Hələ ekipaj üzvlərinin həyatını nəzərə almıram. Sizin hamınızı tribunala vermək lazımdır. Əlimdə imkanım olsaydı hər birinizi özüm güllələyərdim, – deyə üzünü tankın əvvəlki heyətinə tutdu Əhməd.

Qolundan qan axırdı, amma elə bil bundan xəbəri yox idi. Tank itkisi, daha doğrusu, satqınlıq nəticəsində itirilən tank onu o qədər sarsıtmışdı ki, yaralarından şoralanan qanın fərqində deyildi. Yenə gözləri nəsə axtarır və

təəssüflənirdi. Elə bil nəsə baş verəcəkdi. Elə baş verəcək hadisəni izləmək üçün hazırlayırdı özünü.

Nə baş verir, Əhməd, – deyə professor Cəlaləddin Qasımov soruşdu (Həmin gün döyüşü müşahidə etmək professora nəsib olmuşdu).

Əhməd durbini professora uzatdı.

– Yaxşı bax, itirdiyimiz tankı bəlkə də son dəfə görəcəksən. Və orada nələrin baş verdiyini mənə danış.

Əhməd əllərini çarpazlayıb başına yastıq elədi.

Professor gözünü durbinə söykəyib itirdiyimiz torpaqlara baxanda sinəsindən bir ah qopdu. Kövrəlməkdən özünü saxladı.

– Aha, deyəsən, tanka sarı gələn var. Bir, iki... düz beş erməni tanka yaxınlaşır. Çatdılar. Tankın o üz, bu üzünə keçirlər. Yəqin işə salmaq istəyirlər. Daha biri yaxınlaşır...

Tank düşmən mövqeyində qalmışdı deyə, ermənilər rahatlıqla var-gəl edir, mühərriki işə salmağa çalışırdılar. Quldurlar getdikcə çoxalırdı. Daha bir tank da yaxınlaşdı. Nələrin baş verdiyini gördüyüm üçün daha çox təəssüflənirdim. Çünki elə bu an tankı işə salıb aparacaqdılar bu nankor köpəklər, biz də seyrçi kimi uzaqdan baxıb köks ötürəcəyik, demək istəyirdim ki, güclü partlayış baş verdi. Düşmənə “hədiyyə” verdiyimiz dəmir nəhəng yanındakı tankı və canlı qüvvəni də məhv etməyi bacardı. Təşviş içində idim, nələrin baş verdiyini anlaya bilmirdim.

– Nələr baş verir, Əhməd? – deyə qışqırdım.

– Narahat olma, professor, bayaqdan gözlədiyim də elə bu idi, – Əhməd acı-acı gülümsündü.

Sən demə, cəsur soydaşımız Əhməd tankın əldən çıxacağını yəqin etdikdən sonra, fürsət tapıb lazımi yerə mərmi – partlayıcı yerləşdiribmiş.

Bu idi türk oğlunun cəsarəti, yenilməzliyi, hətta itirilən tankla düşmənin canlı qüvvəsini və bir tankını da məhv etməyi bacardı.

İbrət götürüləsi səhnədir, elə deyilmi?

Əhməd Şuşada itirilən tankı xatırladı. O dəhşətli məqamlar göz önündə canlandı. Və yalnız indi hiss elədi ki, qolunda ağrılar var. Heç yaralarının sarındığından xəbəri olmuşdu ki...

– Şuşada idik. Ermənilər hücuma keçdilər. Qısa zamanda qarşısı alındı. Düşmən qaçmağa məcbur oldu. Mənim tankım yenə də öndə idi. Biz ermənilərin üzərinə doğru irəlilədik. Bu zaman 366-cı alayın peşəkar artilleriyası ermənilərə köməyə gəldi. Hədəfdən yayına bilmədim, tankın tırtılı yerindən çıxdı. Beləliklə, digər texnikalarımız da bir-bir vuruldu. Geri çəkilməyə məcbur olduq. Tank təbii ki, orada qaldı. O zaman da tanka partlayıcı yerləşdirib çıxa bildik. Kənardan izləməyə başladıq. Gördük ki, təxminən 10 nəfərə ya-

xın bir dəstə yaxınlaşdı tanka. Bəlkə də yaxşı qənimət sayırdılar. Axı elə də ağır zədələnməmişdi. Nəhayət, tankı yerindəcə nizamlayıb aparmağa çalışdılar. Aralarında rus əsgəri də vardı. Tank yerindən tərpənər-tərpənməz partlayıcı işə düşdü. Göydən dəmir parçaları tökülürdü. Orada olan bütün əsgərlər, o cümlədən, iki rus əsgəri yerindəcə gəbərdi, biri isə ağır yaralanmışdı.

Həmin axşam Rusiya televiziyasının "Vesti" proqramı xəbər yayımladı. Guya Şuşadan atəş açıblar. Mərmi 366-cı alayın bazasına düşüb, iki rus əsgəri həlak olub, biri isə yaralanıb...

Əhməd danışdıqca, qaşları dartılır, yumruğu daha da düyünlənirdi. Şuşa, Laçın Qubadlı kimi cənnətməkan torpaqların düşmən əlində olması onu için-için göynədir, orduda və eləcə də ölkə daxilində baş verənlərə göz yuma bilmirdi.

Əhməd xalası oğlu Siracdan da yaman narahat idi. O zaman Sirac Əsədov Kəlbəcər istiqamətində – Murovda döyüşürdü. Əhmədin cibindəki şəkil də xalası oğlunun şəkli idi. Hər döyüşdən sonra çıxarıb baxar, dodaqaltı nəsə pıçıldayardı. Elə bil ona qovuşmağa can atırdı. Elə qovuşdu da. Qısa zaman kəsiyi ayırdı onları. Hər ikisi eyni ildə (1993) şəhidliyə ucaldı. Eyni amal, eyni istək nəhayət ki, onları birləşdirdi.

Əhməd peşəkar hərbçi, cəsur tankçı, mahir nişançı idi. Döyüşlərdə qəhrəmanlıqla vuruşdu. Dəfələrlə ağır yaralansa da, arxa cəbhəyə qayıtmaq haqqı olsa da, heç vaxt səngəri sahibsiz qoymadı. Ağdamın Qızıl Kəngərli kəndindəki döyüşü isə daha amansız oldu. Düşmən həddən artıq canlı qüvvə və ağır hərbi texnika ilə hücuma keçmişdi o gün. Əhməd idarə etdiyi tankla bir neçə saat bu hücumun qarşısını ala bilsə də, özü barədə düşünmürdü. Elə irəli can atır, daha çox qulduru məhv etməyə çalışırdı. Amma xəbəri yox idi ki, düşmən gülləsi onu qarabaqara izləyir.

Üç ay sonra 25 yaşı tamam olacaqdı, yaman tələsdi şəhidliyə. Yox, o, öz arzusuna çatmağa tələsirdi. Həmişə: "Şəhidlik hər kəsə nəsib olmaz, amma onu qazanacağam", – deyirdi. İstəyinə çatdı Əhməd Mehbalıyev. Qəhrəmanlıq tarixi yaza-yaza nəsillərə bir örnək, bir ibrət oldu.

Füzulidən, Zəngilandan, Qubadlıdan, Laçından, Şuşadan, Ağdamdan, daha haralardan keçmədi Əhmədin döyüş yolu. O, qorxmazlığı, cəsarəti ilə dastanlaşdı, qəhrəmanlığı dillərə düşdü. Amma bircə dəfə də olsun, nə qızı Firənginazın dodağından qopan ata kəlməsini eşitdi, nə də ciyərparası Şəhla xanımın bir stəkan çayını içə bildi. Ailəsiylə bağlı arzularını da, torpaq, yurd sevgisini də özüylə birgə torpağa gömdü Əhməd.

*...Evə zəng gəldi. Səttar müəllim dəstəyi qaldırdı.*

*Deyəsən, xoş xəbər deyildi. Səttar müəllimin üzündəki ifadə bunu deməyə əsas verirdi. İsfəndiyar yoxa çıxmışdı. Bütün qohum-əqrəbadan soruş-*

*muşdular onu, ancaq izi-tozu bilinmirdi. Elə bil bir əlçim bulud olub göyə çəkilmiş, ya da bir damcı su olub dəryaya qarışmışdı. Hamı narahat idi. Artıq polisə də xəbər verilmişdi. Ancaq yenə də İsfəndiyardan bir xəbər gətirən yox idi. Deyilənə görə, sonuncu dəfə Şəhidlər xiyabanında – əmisi Əhmədin məzarı üstündə görmüşdülər onu.*

*Əmisinin vaxtsız vəfatını qəbul edə bilmirdi İsfəndiyar. Ona görə də qisas hissi baş qaldırmışdı içində. Hətta Əhmədin məzarı üstündə and içmişdi ki, bu nahaq qanı yerdə qoymayacaq. Səttar müəllim oğluna dəfələrlə təpinsə də, İsfəndiyar atacağı addımı yüz dəfə ölçüb-biçmişdi.*

*Artıq ikinci ay idi ki, İsfəndiyardan səs-soraq yox idi.*

*Ümidlər tükənirdi yavaş-yavaş. Ümidsizlik içində ümid işığına tapınan valideynlər İsfəndiyarın dönəcəyi günə inanırdılar. Əlləri qoynunda qalan ananın göz yaşları da qurumuşdu. "Oğul, niyə əzab verirsən mənə, səni bu gün üçünmü böyütmüşdüm?! Axı arzularımın qanadı bilirdim səni, səninlə nəfəs alır, səninlə döyünürdü ürəyim. Bəs haralarda qaldın, oğul! Acmısan, susuzmusan?" – deyə hönkürdü ana, iztirablarını gizlətməyə çalışsa da, bacarmadı. Günlər ayları əvəz edirdi.*

*Bir zəng gəldi. Artıq Səttar müəllimin yanaqlarında təbəssüm puçurlanmışdı. İsfəndiyarın xoş xəbəri eşidilirdi dəstəyin o başından. Evdən gülüş-qəhqəhə səsi yüksəlirdi göyə. İki aylıq iztirab şadlıqla sona yetməkdə idi.*

*Sən demə, İsfəndiyar əmisi Əhmədin qisasını almaq üçün birbaşa döyüş bölgəsinə – Tovuzun Əlibəyli kəndinə, daha doğrusu, Əlibəyli postuna gedibmiş. Balaca İsfəndiyarın cəsurluğu əsgərləri heyran qoyduğu üçün ona silahların dilini öyrətməyə çalışıblar. O da sursatın, ərzağın postlara daşınmasında əsgərlərə yaxından kömək edib. Bir sözlə, bu iki ayda əsgərlərlə qaynayıb-qarışıb. Komandir bu balaca qəhrəman haqqında xəbər tutanda isə, onu valideyninə çatdırmaq üçün qərar verib. Beləcə, İsfəndiyar iki aylıq səngər həyatı ilə vidalaşmalı olub. Ancaq heç kim bilmirdi ki, o zaman İsfəndiyarın cəmi on yaşı vardı.*

Cəsur soydaşımız Əhməd Mehbalıyevin igidliyi, rəşadəti, yenilməzliyi nəzərə alınaraq, hələ sağlığında ikən "Azərbaycanın Milli Qəhrəmanı" adına layiq görülməsi üçün təqdimat yazılmışdı. Ancaq ölümündən sonra "Azərbaycan Bayrağı" ordeni ilə təltif edildi. Hazırda Sabunçunun Qaraçuxur qəsəbəsindəki küçələrdən biri qəhrəman soydaşımızın adını daşıyır. İnanırıq ki, haqq və ədalətin bərpa olunacağı gün elə də uzaqda deyil.

Sözümün sonunda vətənpərvər yazarımız İsmayıl Hüseynquliyevin tankçı Əhmədə həsr etdiyi "Yaşa, igid qəhrəman" şeirini qəhrəman oğullar üçün ərməğan eləmək istədim.

Sevir bütün el-oba
Bizim tankçı Əhmədi.
Həzidən bir örnəkdi
Qeyrəti, mətanəti.

Vətənin səmasını
Qara bulud alanda,
Qarabağ torpağını
Düşmən tapdalayanda.

O vaxt başqa ölkədə
Xidmət edirdi Əhməd.
Onu qaytardı evə
Doğma yurda məhəbbət.

Böyük tank taqımına
O, başçılıq elədi.
“Qanı qanla yuyarlar –
Dostlar, irəli?” – dedi.

Baş leytenant igid, ər
Bax beləcə döyüşdü.
Laçın, Qubadlı, Tərtər,
Ağdam üçün vuruşdu.

O, sərrast atəşiylə
Susdururdu düşməni.
Mazutlu, Fərəcanda
Can verirdi erməni.

Dedi gərək rədd olsun
Quduzlar bu torpaqdan.
Seçmədi Qubadlını,
Laçını Naxçıvandan.

Axı Araz, Kür, Tərtər
Mənim şirin canımdır.
Vətənin hər qarışı
Doğma Naxçıvanımdır.

Onun qəhrəmanlığı
Gənclərə örnək oldu.
Qızıl Kəngərlidə də
Şəhidliyə ucaldı.

İgid, uyu torpaqda –
Öz ata ocağında.
Hünərlə qoruduğun
Vətənin qucağında.

Doyunca görmədiyin
Tək balan böyüyəcək.
O yenilməz adınla
Xalqımız fəxr edəcək.

Qanınla qazandığın
“Azərbaycan Bayrağı”.
Sevdirəcək hər kəsə
Bu yurdu, bu torpağı.

**Ötərxan ELTAC**



**ZİYARƏT**

## ANAMIN MƏŞHƏD SƏFƏRİ



Müqəddəs yerləri ziyarət etmək hər bir insanın arzu-istəyi, Kəbəni ziyarət etmək isə hər bir müsəlmanın borcudur. Əmim oğlu Hacı Ədalətin qızını və nəvəsini Təbrizə həkimə aparmaq, oradan isə Məşhəd şəhərinə gedərək oranı ziyarət etmək istəyinə anam Əsmətel xanım da qoşuldu. Bizimlə məsləhətləşəndən sonra onun da həm həkimə yoxlanılmaq, həm də çoxdandır arzusunda olduğu Məşhəd şəhərini ziyarət etmək imkanı yaranmışdı. Açığı neçə il idi ki, anam Bakıda müalicə olunsa da, müəyyən ağrıları qalmaqda idi.

Bu yazını yazmağa bəlkə də heç lüzum yox idi. Lakin anamın səfər zamanı düşünülmüş şəkildə özü ilə qeyd dəftərçəsi götürməsi, hər gün axşam oturub gündəlik yazması məni bu yazını yazmağa həvəsləndirdi.

2014-cü ilin sentyabrında anam yaxın qohumlarımız Hacı Ədalət, Rafiq, Samir, Fatma (Fema), İlhamə, Nuranə və İsmayıl ilə birlikdə İrana yola düşüblər. Səfər barədə əlavə heç nə yazmadan elə sözügedən gündəliyi təqdim etməyim kifayətdir.

**23 sentyabr.** Səhər saat 5-də evdən çıxdıq. Saat 9:30-da Biləsuvara çatdıq. Yemək yedik. Qızım Rəfiqə ilə danışdım. Günorta saat 1-ə kimi gömrükdən keçdik. Ən azı 10 yerdə pasport yoxladılar. Hər yerdə "başını bağla" deyirlər. Saat 13:00-da taksi ilə Təbrizə yola düşdük. Saat 15:30-da Savalan dağının ətəyində yemək yedik (əgər yemək demək mümkünsə). Buradan başı qarlı Savalan dağı çox gözəl görünür. Axşam saat 6-da Təbrizə çatdıq. İki saat sonra otelə yerləşdik. Biləsuvardan Təbrizə 400 km yol getdik. Yolların kənarı bizim Göyçəni xatırladır. Amma dağlar bombozdur. Axşam saat 23:00-da yatdıq.

**24 sentyabr.** Səhər saat 7-də oyandıq, səhər yeməyi yedik. Saat 10-da yoldaşlarımdan bir neçəsi getdi gəzməyə. Mən aşağı düşdüm, başım hərləndi, qayıtdım otelə. Nuranə, İlhamə və mən oteldə oturduq. Axşam saat 22:00-da həkimə getdim. Saat 24:00-da otele gəldim və yatdıq.

**25 sentyabr.** Səhər saat 8-də yuxudan durub səhər yeməyi yedik. Dərmanlarımızı alıb sonra "Lalə park"a getdik. Bu park Bakıdakı "28 Mall" kimidir, onu xatırladır. Bir az gəzdikdən sonra nahar yeməyi yedik. Bu gün Məşhədə bilet olmadı. Sabah saat 5:00-a bilet aldıq. Təbrizdən Məşhədə 1600 km-dir.

**26 sentyabr.** Səhər durduq. Yemək yeyəndən sonra getdik şəhərə gəzməyə, xalçalara baxdıq. Həqiqətən də Təbriz xalçaları gözəlliyi ilə göz oxşayır. Mən konfet və bir-iki xırda-xuruş şey aldım. Saat 5:00-da avtovağzaldan Məşhəd şəhərinə yola düşdük. 23:30-da Zəncan şəhərinə çatdıq.

**27 sentyabr.** Saat 3:00-da – 22 saatdan sonra Məşhədə çatdıq. Otelə getdik. Çay içib saat 5:00-da ziyarətə getdik. Məşhəd biz şiələrin müqəddəs şəhəridir. Çoxlu tarixi binalar, məscidlər adamı heyran edir. İmam Rzanı ziyarət etdik. Ziyarət zamanı özümü çox yaxşı hiss etdim. Ziyarətdən sonra gəldik bazara. Bir az şəhəri gəzib gəldik otelə. Ərdəbilə sabah üçün bilet aldıq. Bu gün Məşhəd şəhərində mənim 63 yaşım tamam oldu.

**28 sentyabr.** Səhər yenə ziyarətə getdik. Sonra yenə bazara getdik. Saat 2-də taksi ilə avtovağzala gedib, Ərdəbilə yola düşdük. 24 saat yol getməliyik.

**29 sentyabr.** Yolumuz bir az uzandı deyə Ərdəbilə çatmadıq. Getsəydik onda gömrük yoxlanışına çatmırdıq. Saat 2-də çatdıq İran Astarasına. Astarada düşdük. Oradan Astara gömrüyünə 20 dəqiqəlik yoldur. Gəldik ora, gömrükdən çox çətin keçdik. Adam çox idi. Birtəhər saat 5:00-da keçid məntəqəsindən keçdik. Gecə saat 2:00-da evə çatdıq. Vəssalam. Bu da bizim 7 günlük İran səfərimiz...

**Araz YAQUBOĞLU**

**POEZİYA**

**Ayaz İMRANOĞLU**



## AÇILA, YA AÇILMAYA

Nə baxırsan oğrun-oğrun?
Yollar uzun, illər yorğun.
Bir dünyam var, rəngi tutqun,
Açıla, ya açılmaya.

Gecə-gündüz daş daşıyan –
Tənhalıqla başbaşayam.
Ömrün düyün yaşındayam,
Açıla, ya açılmaya.

Yuxularda uçub göyə,
Qonub qaranlıq gecəyə.
Ümid qapım gələcəyə
Açıla, ya açılmaya.

## DÜNYANIN YARIMDƏLİSİ

Mənəm bu dünyanın yarımdəlisi,
Həsrətin, vüsalın, yarın dəlisi,
Qopuzun, tütəyin, tarın dəlisi,
Qobustan qavalı, heykəl daşıyam.

Ah çəkdim, Arazdan axdı göz yaşım,
Ağlayır yurdumun torpağı, daşı,
Hanı bu ocağın dava-dalaşı?
Soyum Dədəm Qorqud, özüm naşıyam.

Lal ollam, içimdən göyərər varım,
Haylayar adımı vəfalı yarım.
Mən ki Türk oğluyam, tükənməz barım,
Min il ömür sürəm, min il yaşıyam.

Bu dəli nərələr zirvəyə çatar,
İlahi, özümü özümə qaytar.
Əbədi bahara yol gedir qatar,
Mən durna köçündə durnabaşıyam.

## EDAM KÖTÜYÜDÜR DÜNYA

Gecəsi var, gündüzü var,
Həm əyrisi, həm düzü var.
Bu dünyanın hər üzü var,
Tanrı ətəyidir dünya.

Çoxalıb qoca-qarısı,
Hanı aydan da arısı?
Qırılır, qalmır arısı,
Arı pətəyidir dünya.

İsgəndəri qəmiş yıxdı,
Əyri çaldıq, doğru çıxdı.
Oyna-oyna, yıxayıxdı,
Kimin tütəyidir dünya?

Sevgisi baldı, bal dadır,
Mən sevirəm, o aldadır.
Bir də gördün baş qaldadır,
Edam kötüyüdür dünya.

### ÖZÜM OLMAQ İSTƏYİRƏM

Lal ol dilim, dibdən kəsil,
Ögeyləşdim nəsil-nəsil.
Hanı doğma, hanı əsil?!
Özüm olmaq istəyirəm!

Ağu içdim, bal dadırdı,
Üzüm adam aldadırdı.
Öymə məni – yamaq yaddı!..
Özüm olmaq istəyirəm!

Qoru məni, oddan qoru,
Yamanlıqdan, yaddan qoru.
Yada yalaq anddan qoru!
Özüm olmaq istəyirəm!

Doğma sözlərlə alışdır,
Tanış dərdlərlə danışdır.
Məni özümə qovuşdur –
Özüm olmaq istəyirəm!
Özüm olmaq istəyirəm!

### VƏTƏN

Bölünən mən, bölən yaddı,
Döyülən mən, döyən yaddı.
Söyülən mən, söyən yaddı,
Vətən, viran olum, olum!

Özgə payı, özgə sözdü,
Özgələşmək məni üzdü.
Dərd yükümə dözən dözdü,
Vətən, talan olum, olum!

Arazında batan deyir,
Vüsalına çatan deyir,
Hər dili söz tutan deyir,
“Vətən, qalan olum, olum!”

**ARAŞDIRMA**

## DİV EVLƏRİ

Dünyanın ən qədim insan mədəniyyətinin, memarlığın formalaşdığı Azərbaycan qədim insan məskənləri ilə dünya tarixinin daş yaddaşına həkk olunmuşdur. Qədim sivilizasiya məkanlarının mərkəzində dayanan, əsrlərin yadigarı, təkrarolunmaz tarixi abidələrlə zəngin, qədim insan mədəniyyətinin formalaşdığı, yaşı milyonu aşan insan yaşayış məskənləri olan Azərbaycan diyarının Laçın adlı kiçik bir bölgəsi mövcuddur. İstər əvvəllər, istərsə də son dövrlərə qədər bu bölgənin keçmişini, bu gününü və gələcək inkişaf perspektivlərini işıqlandıran xeyli materiallar çap olunsa da, bu bölgədə mövcud olan yaşayış məskənləri, tarixi abidələr, minlərlə böyük kurqanlar haqqında heç bir tarixi ədəbiyyatda qeydlər edilməmiş, arxeoloqlar tərəfindən araşdırılmamış, ümumiyyətlə tarixi abidələrin düzgün qeydiyyatı belə aparılmamışdır.

Aparılan müşahidə və araşdırmalardan belə qənaətə gəlmək olar ki, indiki Laçın rayonunun ərazisində yaşamış ibtidai insanlar çay kənarında, me-

şələrdə, mağara və zağalarda özlərinə məskən salmışlar. Qeyd edək ki, Laçın rayonunun Kürdhacı kəndi ərazisində olan Ağzıbir, Farmaş və digər mağaralar (zağalar) bu ərazilərdə ibtidai insanların yaşamasından xəbər verirdi. Hətta 1960-1970-ci illərə qədər yaz fəsli yağmurlu keçəndə heyvandarlıqla məşğul olan kənd sakinləri müəyyən müddət heyvanları həmin mağaralarda (zağalarda) saxlayardılar. Mağaralar müxtəlif otaq və yaxud hissələrdən ibarət idi. Mağaranı gecə işıqlandırmaq üçün hisli çıraq, çıraq və digər bu tip işıqlandırma avadanlıqlarını qoymaq üçün müvafiq yerlərdə xüsusi dəliklər açılmışdır. Neft məhsullarının çox az tapıldığı bu yerlərdə işıqlandırma avadanlıqlarından istifadə üçün yerli şəraitə uyğun olaraq heyvani yağlarla (kərə yağ və iç yağlar) yanaşı bitki mənşəli materiallardan da istifadə edilərdi. Kənd əhalisi əsasən bu ərazilərdə geniş yayılmış vələs ağacının qurudulmuş qabığından istifadə etmişdir. Bunun üçün iri, düz gövdə və budaqların qabığı bir neçə santimetr endə olmaqla lazımi uzunluqda soyularaq qurudulub hazırlanardı.

Bəşər övladı özünü dərk edərək fiziki imkanlarına bələd olduqca həyat şəraitini daha da yaxşılaşdırmaq üçün müxtəlif vasitələrdən istifadə etməyə çalışmışdır. Bunun üçün tunc dövrünün əvvəllərində və tunc dövründə yaşamış ibtidai insanlar birinci növbədə ilk yaşayış yerlərini – mağara, kaha və zağaların şəraitini yaxşılaşdırmağa çalışdı. Son nəticədə daha yaxşı, daha əlverişli yaşayış yerləri – siklop (təpəgöz) tikililər adlanan süni mağaralar inşa etməyə başladılar. İnşa edilmiş bu tip mağaraların bir çoxunun müəyyən hissələri dövrümüzə qədər gəlib çıxmışdır. Bu tikililərin heç də hamısı eyni məqsəd üçün tikilməmişdir. Onların bəziləri dini tikililər, yəni ibadətgah kimi, bəziləri ticarət yolu üzərində tikilərək həmin yolun müdafiəsi üçün, bəziləri isə düşmən hücumu zamanı əhalinin müdafiəsi, digərləri isə yaşayış üçün inşa edilmişdir. Siklop (Təpəgöz tikililər) inşa edilərkən heç bir əhəng-gəc qatışığından istifadə edilməmişdir. Tikintilərin bir hissəsi tunc dövründən əvvəl və yaxud tunc dövrünün əvvəllərində inşa edilmişdir. Bu tikililərin inşası zamanı istifadə olunan daşların heç biri yonulmamış, əhəng, gəc və başqa qatışıqlardan istifadə edilməmişdir. Tikililərin digər, əsas hissəsi tunc dövründə tikilmiş, bu tikililərin inşası zamanı daşlar müəyyən qədər yonulmuş, tikintinin inşası zamanı müxtəlif alət və əşyalardan istifadə edilmişdir.

Azərbaycan Respublikasının ərazisində Böyük Qafqaz sıra dağlarının cənub-şərq ətəklərində, Kiçik Qafqaz sıra dağlarında, Laçın, Qubadlı rayonlarının, eləcə də Şirvan ərazisində siklop (təpəgöz) tikililərə rast gəlmək olur. Bu tikililərin bir çoxu günümüzə qədər araşdırılmamış halda qalmaqdadır.

Laçın rayonunun Kürdhacı kəndinin ərazisində Çınqılın yalı adlanan sahədə üç siklop (təpəgöz) tikilisi dövrümüzə qədər öz görkəminin müəyyən

hissələrini saxlamışdır. Bunlardan ikisi bir-birinə yaxın məsafədə inşa edilmişdir. Tikilinin divarının hörülməsi zamanı heç bir əhəng-gəc və ya başqa qatışıqlardan istifadə edilməmişdir. Tikili inşa edilərkən daşların heç biri yonulmamış, yalnız daşlar seçmə üsulundan istifadə edilərək hörülmüşdür. Bu isə tikililərin tunc dövrünün əvvəllərində inşa edildiyini deməyə əsas verir. Azərbaycanın digər ərazilərində olan siklop (təpəgöz) tikililərdən fərqli olaraq bu tikililərin inşası zamanı istifadə edilən daşlar bir qədər xırdadır. Tarixi abidənin bu xüsusiyyəti nəzərə alındığı üçün çox təəssüf ki, sovet dönəmində tikili abidə kimi qeydə alınmamışdır.

Bu tip siklop (təpəgöz) tikililər ərazinin təbii-coğrafi şəraitindən, ibtidai insanların ilkin məskunlaşmasından xəbər verir. Hər hansı ərazidə siklop (təpəgöz) tikililər inşa edilən yerlər seçilərkən təbii fəlakətlərin baş verə biləcəyi yerlərdən uzaq, şirin su mənbəyinə (bulağa) yaxın məsafədə olması əsas məsələlərdən biri olmuşdur. Hündür təpənin üstündəki talada iki siklop (təpəgöz) tikilisi yanaşı, digəri isə onlardan bir xeyli aralı və hündür yerdə inşa edilmişdir ki, bu siklop (təpəgöz) tikilisi digər iki tikilidən xeyli kiçikdir. Talanın aşağı hissəsində yerləşən birinci tikilinin üst hissəsi tamamilə dağılsa da, aşağı hissədə divarlar salamat qalmışdır. Bayır hissədən divarlar uçmuş daş qalıqlarının altında qalmış, diqqətlə baxdıqda isə olduqca aydın şəkildə sezilən salamat divar qalıqları mövcud idi. Lakin otağa üst hissədən daxil olarkən otağın divar hörgüsü çox aydın görünürdü. Divardakı daşların düzülüşü, bağlamaların düzgün verilməsi olduqca ustalıqla aparılmışdır. Yaxınlıqda olan ikinci siklop (təpəgöz) tikilinin isə üst hissəsi tamamilə uçmuş və uçmuş daşların bir hissəsi otağın içərisinə töküldüyündən divarlar nə xaricdən, nə də daxildən görsənmir. Üçüncü siklop (təpəgöz) tikili isə ya tamamilə uçmuş, yaxud da yarımçıq tikilmişdir. Bu tikilinin qalıqları digər iki tikilidən xeyli kiçikdir.



El arasında bu böyük tikililər "Div/Dev evləri" kimi tanınırdı. Yaşlı insanlar bu tikililər haqqında belə bir rəvayət söyləyirdilər ki, dünya binnət olan zamanlarda bu ərazilərdə iki bədheybət div dünyaya göz açmış və yaşamışdır. Əsasən uşaq nağıllarında müsbət qəhrəmanlara qarşı qoyulan çirkin, olduqca eybəcər, həddən artıq iri bədənli, buynuzlu əfsanəvi vücud

olan bu divlərdən biri ağ, digəri isə qara rəngdə olmaqla dünyaya meydan oxuyarmışlar. Birlikdə bu ərazilərdə gün-güzəran keçirən ağ div dişi, qara div isə erkək olmuş və hər iki divin əllərindəki baş barmaqlar bir-birinə bitişik olaraq doğulmuşdur. Buna baxmayaraq onlar çox güclü olmuşlar. Yaxın ərazilərdə olan bütün canlılar onlardan qorxurdular. Belə nəql edirdilər ki, Tanrı bilərəkdən onların baş barmaqlarını bitişik yaratmışdır. Əgər bütün dünyanı qorxuya salan, lərzəyə gətirən bu divlərin əllərindəki baş barmaqlar bitişik olmasaydı onlar öz tükənməz gücləri ilə ətrafdakı canlıları tam məhv edərdi. Yay və qış otaqları kimi yanaşı inşa olunmuş bu siklopların birində qışlayan divlər digərində yaylayırdılar. Bu fikri yaşlı insanlar tikililərin quruluşuna əsasən söyləyirdilər.

Azərbaycanın İşğal Olunmuş Ərazilərindəki Tarix və Mədəniyyət Abidələrini Müdafiə Təşkilatı İctimai Birliyinin sədri Faiq İsmayılovun apardığı araşdırmalardan məlum olur ki, ucqar dağ rayonlarından sayılan Laçın rayonunun ərazisində dövlət qeydiyyatına düşməyən xeyli sayda tarixi abidələr bu gün də mövcud olaraq qalır.

Ermənistan Respublikasının Silahlı Qüvvələri tərəfindən işğal edilmiş Kürdhacı kənd ərazisinin müxtəlif yerlərində dövlət qeydiyyatına alınmamış çoxlu sayda üzərində alban və ərəb qrafikalı yazılar olan baş və sinə daşları var idi. Həmçinin kənd qəbiristanlığında daşdan yonulmuş qəbirüstü qoç və at fiqurlarının son nüsxələri – iki qoç və bir at fiquru isə 1970-ci illərin əvvəllərində erməni siyasətinin "qurban"ına çevrildi. Filologiya üzrə fəlsəfə doktoru Əli Umud oğlu Əliyevin apardığı araşdırmalara əsasən hayların (ermənilərin) olduqca çox təhlükəli, yumşaq siyasəti nəticəsində bu tip "qurban"ların müəyyən hissəsi ərazinin işğalına qədər, qalan hissəsi isə işğaldan sonrakı dövrdə oğurlanmış və ya məhv edilmişdir.

Bu gün dövlət qeydiyyatına alınmayan abidələrin qeydiyyatı məsələsi gündəmdə dayanmasa və bu istiqamətdə Azərbaycan hökuməti tərəfindən lazımi səviyyədə işlər aparılmasa yəqin demək olar ki, mənfur qonşularımız olan haylar bizləri qabaqlayaraq nəinki Azərbaycanın işğal olunmuş ərazilərindəki tarix və mədəniyyət abidələrini, eləcə də Azərbaycanın digər ərazilərində olan və dövlət qeydiyyatına alınmayan abidələri çox asanlıqla qeydiyyata alıb özününküləşdirəcək və bütün dünyaya erməni abidələri kimi təqdim etməyə başlayacaqlar. Gəlin bu dəfə gecikməyək!



**Sultan HÜMBƏTOV**

**OVQAT**

## MƏNİM İLK MÜƏLLİMİM

Çox kiçik idim. Nə çiynimdəki çantaya, nə də əlimdəki gül buketinə gücüm çatırdı. Böyük bir binanın qabağına yetişəndə "məktəbə çatdıq" dedilər. İçəri girdik. İçəridə mənim kimi eyni geyimli uşaqlar var idi. "Əlindəki buketi müəllimənə ver" – dedilər. "Müəllim" – əslində bu söz mənə yad deyildi. Axı mənim valideynlərimi də belə çağırırdılar.

Orta yaşlı bir qadın mənə tərəf gəldi, anladım ki, bu mənim müəlliməmdi. Ürkək baxışlarla onu süzdükdən sonra mən də ona yaxınlaşdım. Çox həyəcanlıydım, həm də qorxurdum. Buketi ona uzadanda kənardan bir səs eşitdim – "Bura baxın, şəklinizi çəkirəm". Həyəcandan bantım açılıb əlimdə qaldı. Bu da mənim ilk müəllimimlə ilk şəklim oldu. O insanla ki, illərlə vaxtımın çoxunu onunla keçirdim. Evdə anam, məktəbdə o qayğı göstərdi mənə. Anamız kimi, uşaqlar arasında fərq qoymadan nəvaziş göstərərək sevdi bizi...

Zaman keçdikcə çox müəllimlərlə tanış oldum. Həm elm öyrətdilər, həm həyat dərsi. Onların dediklərinin çoxunu böyüdükcə anladım.

5 oktyabr o müqəddəs insanların bayramıdır. O dəyərli insanları ildə bir gün deyil, ilin bütün günlərində yada salmaq lazımdır.

Əziz müəllimlər, bayramınız mübarək. Sizlərə cansağlığı diləyirəm və arzu edirəm ki, çəkdiyiniz əziyyət, verdiyiniz əmək heç bir zaman yerdə qalmasın. Hər zaman şagirdlərinizlə fəxr edəsiniz.

Xüsusilə, üzərimizdə çox böyük haqqı olan, "Tərəqqi" medalına layiq görülmüş Gülşən Tağıyevanın rəhbərlik etdiyi Laçın rayon 10 №-li tam orta məktəbinin pedaqoji kollektivini ürəkdən təbrik edir, müqəddəs peşə sahiblərinə uğurlar arzulayıram!

## QAÇQINLIQDA BİTƏN ÖMÜR...

Bir qoca vardı... İllərin sınağından çıxmış, yaxşını da, yamanı da görmüş, əlləri zəhmətdən qabar atmış bir qoca. Bir qoca vardı, danışanda elə sanardın ki, kitablar dil açıb səninlə söhbət edir. Saatlarla bitməzdi o qocanın söhbəti. Hər kəs də böyük maraqla oturub dinləyərdi onu.

Bu qoca çox çətin və keşməkeşli həyat keçirmişdi. Həyat onu hər zaman çox ağır sınaqlara çəkmişdi. Ancaq onun üçün ən ağır olanı didərgin düşdüyü torpağının sevgisi, vətən həsrəti idi. O uzun illər o torpaqlarda yaşamışdı, yaratmışdı, ancaq tam bu anda onun o torpaqlara – havasına, suyu-

na ehtiyacı daha çox olduğu anda didərgin düşmüşdü el-obasından. Məcburən başqa yurdlara sığınmışdı o da. Ancaq vətən həsrəti onu yandırıb-yaxırdı. Həsrət dolu bayatılar yazırdı. Çox sevirdi yazmağı. Mənim yazılarımı da hər zaman bəyənirdi (çox təəssüf ki, bu gün mən onun ölümü haqda yazıram). Gözəl səsi də var idi. Məşhur xanəndələrin səsini belə kölgədə qoyacaq bir səs. Ancaq axır vaxtlar oxumurdu. Yəqin artıq yorulmuşdu yanıqlı, həsrət dolu nəğmələr oxumaqdan. Torpaqların işğaldan azad olunacağı vaxt "Zəfər nəğməsi"ni oxuyacağı, dağlara, daşlara haray salacağı günü gözləyirdi.

Ən böyük arzusuydu onun torpağına, elinə, obasına qayıtmaq. Hər zaman "O torpaqlarda qurub-yaratdım, doyunca yaşamaq qismət olmadı. Kaş bircə orada ölmək qismət olaydı mənə. Son nəfəsimi vermədən oranın havasını içimə çəkib, suyundan bircə qurtum içəydim. Sonra ölsəm də olar" – deyirdi. Axı o yerlər onun doğulduğu, uşaqlığını, gəncliyini keçirdiyi yerlər idi. Bəlkə də ilk sevgisini, ilk iş sevincini orada, o cənnət məkanda yaşamışdı. Ata-anasının qəbri də o dağların qoynunda idi. O da son dayanacağının ora olmasını istəyirdi...

Ancaq olmadı, onun arzuları ürəyində qaldı. O, bu həsrətlə, bu ağrıyla gözlərini yumdu həyata. Son nəfəsini verəndə də ailəsindən tək istəyi SU (dağdakı bulaqların suyu) oldu... Ailəsi ona o sudan verə bilmədi, amma Allah onun ah-naləsini duyub o suları yağış olaraq endirdi. Yayın qızmar istisində şırhaşır yağan bir yağış. O Qoca dodaqlarıyla o sudan içə bilməsə də, qəbri o suyla sulandı.

Bəli o Qoca da o birilər kimi vətən həsrətiylə gözlərini yumdu həyata. Allah rəhmət eləsin!

Bu qəriblikdə, məcburi köçkün həyatında daha kimləri itirəciyik görəsən?! Daha kimlər həyata bu acıyla vida edəcək?!

"Həyat" – vəfasız sənmisən, insanlarmı, bilmirəm. Amma onu bilirəm ki, bir sirr kimi başlayıb, elə bir sirr olaraq da bitirsən...

**Şamama YUSİFQIZI**



**POEZİYA**



**Elbrus ABBASOV**

## DAĞLARIN QƏDRİNİ HARDAN BİLƏSƏN

*Dağlardan nə çox yazırsan deyən*
*"şəhərli dostum"a*

Bizim o dağlara getməmisən sən,
Dağların qədrini hardan biləsən?
Buz çıxan kahaya girməmisən sən,
Dağların qədrini hardan biləsən?

Sən orda sürünüb imək açmısan,
Orda yerimisən, orda qaçmısan?
Cığırında yıxılmısan, durmusan? –
Dağların qədrini hardan biləsən?

Neçə yerdə qoşa bulaq çıxardı.
Biri buztək, biri qaynar axardı.
Xəstələrin imdadına çatardı, –
Dağların qədrini hardan biləsən?

Qartal qurar lap zirvədə yuvasın,
Eşitmisən qıy vuranda sədasın?
Heç görmüsən göllərinin sonasın? –
Dağların qədrini hardan biləsən?

Sayılardı ağsaqqalı, cavanı,
Lap çox idi bir-birinə yananı.
Sirr çıxmazdı, dağlar idi hər yanı, –
Dağların qədrini hardan biləsən?

At belinə telli xurcun atmısan,
Nehrə yağın beçə bala qatmısan?
Yeyib-doyub bulaq üstə yatmısan? –
Dağların qədrini hardan biləsən?

Yağış yağa... alaçıqda yatmısan,
İt hürəndə durub tüfəng atmısan?
Səhər-səhər dağda şehə batmısan? –
Dağların qədrini hardan biləsən?

El olardı xeyirdə bir, şərdə bir,
Mənə inan, abır-isмət kənddədir.
Kaş gələydin sən də dağa hərdənbir, –
Dağların qədrini hardan biləsən?

Vətənsizi, taleyindən küsəni,
Odlananı, alovlanıb bişəni.
Görməmisən, qınamıram mən səni, –
Dağların qədrini hardan biləsən?

Burda inan mən yanıram halıma,
Qohumluq qurama, dostluq qurama.
Dostum, küsüb Elbrusu qınama,
Dağların qədrini hardan biləsən?
Dağların qədrini hardan biləsən?

*03.04.2015*

## ARZUM HƏQİQƏT OLUR

*Nəvəm Ülvi əsgər gedir*

Bir yaşında mən yazmışdım,
Yaradana yalvarmışdım.
Özümə möhlət almışdım,
Şükür, çatmışam bu günə.

Nəvəm Ülvi əsgər gedir,
Doğmalar toy-bayram edir.
Əmi, dayı Yallı gedir,
Şükür, çatmışam bu günə.

Qurban olum Yaradana,
Balam çatıb ada-sana.
Əmanət etdim Qurana,
Şükür, çatmışam bu günə.

Bilirəm ki, alacaqdır
Qisasımı yağılardan.
Bayrağımı asacaqdır
O İşıqlı dağından.

Söylədiyim, gözlədiyim,
Az qalıbdır o günə.
Perik düşmüş elim, obam
Qayıdacaq yerinə.

Gedib əvvəl dolanacam
Qəbirlərin başına.
Öpüb üzümü sürtəcəm
Atamın başdaşına.

...Arxamızda ər qeyrətli
İlham kimi komandan var.
Ramil kimi, Mübariztək
Neçə-neçə qəhrəman var.

Oğul balam, yolun açıq,
İşıqlı bir səfər olsun.
Siz zəfərlə dönün geri,
Sizi tək Allah qorusun!
Sizi tək Allah qorusun!
Amin!

*28.07.2015*

## QOŞA GEDƏK O DAĞLARA

Önüm Murov, arxam Gəncə,
Yuxalıram, qəlbim incə.
Gözləyəcəm sən gəlincə,
Qoşa gedək o dağlara.

Duman çöküb, qar almamış,
Günəş sönüb saralmamış.
Köhlənimiz yorulmamış
Qoşa gedək o dağlara.

Murov bizi haraylayır,
Kəlbəcər elsiz ağlayır.
Laçın dağ çəkir, dağlayır,
Qoşa gedək o dağlara.

Məzarlar üstün kol alıb,
Bağçalar, bağlar saralıb.
Hövsələm yaman daralıb,
Qoşa gedək o dağlara.

Neçə ildir dözmüşük biz,
Vətən deyib gəzmişik biz.
Qaçqınlıqdan bezmişik biz.
Qoşa gedək o dağlara.

Elbrus, tükənib səbir,
Yolumuzu kəsən nədir?
Yığılsın el, töksün tədbir,
Qoşa gedək o dağlara.

*13.04.2015*

## ÖLMƏRƏM

O dağları qarış-qarış gəzməmiş,
Hər bulaqdan su içməmiş ölmərəm.
Xəlfəliyə, Qatar daşa, Arxuda,
Qaranlığa mən keçməmiş ölmərəm.

Qabaq təpə, Ali yurdu, Uzun yal,
Bircə gün də Köhnə yurdda qonaq qal.
Mənlə durur, mənlə yatır bu xəyal,
Arzum kama yetişməmiş ölmərəm.

Qovuşuqda qızıl balıq tutmamış,
Pircan yurdda alaçıqda yatmamış,
Qantəpəri nişan alıb atmamış,
Baldırğanı mən dərməmiş ölmərəm.

Pilləkənlə Nərdivana çıxmamış,
Buzxanadan Çalbayıra baxmamış.
Mixtökənə köhlən minib qalxmamış,
O zirvəni mən görməmiş ölmərəm.

Elbrus vurğundur cavan yaşından,
Bir dəli sevdadır keçir başından.
Atamın o əsir qəbir daşından
Üz söykəyib mən öpməmiş ölmərəm.

## BƏS CƏZANI KİM VERİR

Böhtana, yalanlara,
Nahaqdan adamlara
Quyular qazanlara,
Haqq işi yozanlara,
Yolunu azanlara,
Hiyləgər, pis niyyətə,
Oğruya, cinayətə
Cəzanı hakim verir.
Satılmış məhəbbətə,
Yalançı sədaqətə,
Sevgidə xəyanətə
Bəs cəzanı kim verir?!

*16.05.2015*

**ARAŞDIRMA**

## II DÜNYA MÜHARİBƏSİNDƏ İTKİN DÜŞƏN FƏRƏCANLILAR…
***(siyahı tam deyil)***

**Mustafayev Seyfəli Rza oğlu** 1902-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1942-ci ildə itkin düşmüşdür.

**Nuriyev Fərəc Baxşəli oğlu** 1908-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Nuriyev Allahverdi Rüstəm oğlu** 1908-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1943-cü ildə itkin düşmüşdür.

**Nuriyev Ümid Rüstəm oğlu** 1922-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Nuriyev Məmməd Hüseyn oğlu** 1921-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Nuriyev Süleyman Hüseyn oğlu** 1918-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Nəcəfov Cəlal Xanqulu oğlu** 1911-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1944-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Novruzov Talıb Tarıqulu (Təhməzqulu) oğlu** 1922-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1943-cü ildə itkin düşmüşdür.

**Novruzov Bayraməli Gülmalı oğlu** 1902-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Novruzov Əliyar Tarqulu oğlu** 1923-cü ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1942-ci ildə itkin düşmüşdür.

**Novruzov Əmir Təhməzqulu oğlu** 1907-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Novruzov İsa Cənnətəli oğlu** 1910-cu ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1944-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Qaraşov Qabil Nasir oğlu** 1921-ci ildə Laçın rayonunun Fərəcan kəndində doğulmuşdur. 1943-cü ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər itkin düşmüşdür.

**Mənbə:**


- Azərbaycan Respublikası Xatirə Kitabı, III cild, Q hərfi, Bakı, 2001
- Azərbaycan Respublikası Xatirə Kitabı, XI cild, M, N hərfi, Bakı, 2011


**Hazırladı: Araz YAQUBOĞLU**

**POEZİYA**



**Yeganə İSMAYILQIZI,**
*Laçın rayonu, Qarıqışlaq kəndi*

## QALX AYAĞA, VƏTƏN OĞLU

Qalx ayağa, Vətən oğlu, qalx ayağa,
Qalx ayağa!
Öz sinəni sipər eylə bu qaniçən cəlladlara.
Qalx ayağa, sübut eylə
Sən Koroğlu nərəsisən,
Sən Sultan bəy nəvəsisən.
Sən Bülbülün zənguləsi,
Sən Cıdırın cəngisisən.
Qalx ayağa!
Yat Qıratın yalmanına,
Yönünü tut Ağdam, Şuşa, Laçınıma.
Azad eylə Füzulini, Kəlbəcəri.
Dörd bir yandan səslə bizim ərənləri,
Qalx ayağa!
Azad eylə
Xocalının al qan içmiş torpağını,
Laçınımın başın əymiş dağlarını.
Kürəyini möhkəm söykə
Dövlətinə, millətinə.
Tarix özü şahid olub
Bu xalqımın qeyrətinə.
Sən Babəkdən, Xətaidən güc almısan,
Zaman-zaman düşmənindən öc almısan.
İndi göstər hünərini,
Əz, ayaqla, tapdala sən düşmənini.
Ayaqla ki, bir də heç vaxt
Göz dikməsin Nəsiminin, Natəvanın torpağına.
Qalx ayağa, Vətən oğlu!
Xarıbülbül haray çəkir
Gözəl Şuşa yaylağında.
“Sarı gəlin” ağlar qalıb

Bir erməni dodağında.
Balabanım inildəyir
Bir murdarın barmağında.
Qalx ayağa!
Geri qaytar keçmişləri,
Yerinə qoy, nizama düz itmişləri.
Qalx ayağa!
O içdiyi qanı qusdur qan hərisi canavara.
Sərhədini, səngərini möhkəm qoru,
Gələcəyə inamla bax, Vətən oğlu!
Bil ki, qalib gələcəyik,
Bizi çalan ilanların başlarını əzəcəyik!
Biz Şuşaya, biz Laçına,
Qarabağa gedəcəyik!
Dövlətimin bu üçrəngli bayrağını
Bölünməyən Azərbaycan torpağında
Əbədilik əkəcəyik!
Qalx ayağa, Vətən oğlu!

**KİTAB RƏFİ**

## "LAÇIN ANTOLOGİYASI"




Tədqiqatçı-jurnalist Mübariz Binnətoğlunun tərtib etdiyi antologiyaya XVII-XXI əsrlərdə ədəbiyyata gəlmiş Laçın rayonunun görkəmli şair və aşıqlarından bir neçə nəfərin dünya və Azərbaycan ədəbi mühitində yer tutan əsərlərindən nümunələr daxil edilmişdir.

Antologiyada ədəbi mühitdə kifayət qədər tanınmayan şair və aşıqların da yaradıcılığı işıqlandırılmış, onların bu topluda dərc olunan şeirlərində Vətənə, xüsusən də işğala məruz qalmış doğma torpaqlarımıza sonsuz məhəbbət, mənəvi saflıq, yüksək bəşəri hisslər öz əksini tapmışdır.

**P.S.** *Laçın ədəbi mühitinin 400 illiyinə həsr olunan kitabın sonrakı nəşrlərinə imzası bu antologiyaya düşməyən şair və yazıçıların əsərləri də daxil ediləcəkdir.*

TARİXİ ABİDƏLƏRİMİZ

## SU İLƏ İŞLƏYƏN DƏYİRMANLAR

Laçın rayonu Şuşa, Əsgəran, Xocalı, Kəlbəcər, Qubadlı rayonları və Ermənistan Respublikasının inzibati əraziləri ilə həmsərhəddir.

Yüksək dağ zirvələri, təpəliklər və düzənliklərlə maraqlı relyef quruluşuna malik olan 206 oba, binə və kəndlər, Qayğı qəsəbəsi və Laçın şəhərindən ibarət olan yaşayış məntəqələrindən ibarət idi. 3-5 ailə yaşayan yaşayış məntəqələri binə, 10-20 ailə yaşayan yaşayış məntəqələri oba, 50-dən çox ailə yaşayan yaşayış məntəqələri isə kənd adlandırılmışdır.

1700-cü ildə Osmanlılar, 1890-cı ildə Çar Rusiyası tərəfindən 1924-cü ilə qədər əhalinin və təsərrüfatların siyahıya alınması aparılan kameral təsvir zamanı əldə olunmuş hesablamalara görə müəyyən olunmuşdur. Yaşayış evlərinin, əhalinin nəfər sayı qadın və kişilərin nəfər sayı kimi qeydə alınmışdır.

Laçın rayonunun inzibati ərazisi Şəlvə (kəndi) çayı, Alxaslı (kəndi) çayı və Minkənd (kəndi) çaylarının izi ilə, yüksəkliklərdən, dağ, dərə və yamaclardan süzülərək axan buz bulaqların izi ilə, bəzən də dağların silsilə-silsilə düzülüşü ilə, insan izlərinin açdığı cığırlarla ərazilərə bölünmüşdür. Bu da ərazilərin onların istiqamətləri ilə müəyyən olunmuş xəritəsini cızmışdır.

Həmin çay suları dağların qoynundan süzülüb enərkən, yerin üst qatına çıxmış təbii sərvət olan mineral tərkibli, müalicə əhəmiyyətli buz bulaqlardan öz mənbəyini götürərək birləşib Böyük çay, daha sonra isə Həkəri çayını əmələ gətirir, daha sonra isə Araz çayına qovuşmağa tələsir.

Şəlvə və Minkənd çayları Laçın şəhərindən 10 kilometr məsafədə məskən salmış Zabux kəndi yaxınlığında qovuşurlar. Sular sıldırımlı sal qayaları, sanki, rəhmə gətirmək üçün ayaqlarına dolanıb, ayaqlarını yalayır. Qayaların daş qəlbi isə bu hala əhəmiyyət də verməmiş kimi, özünü o yerə də qoymur, sular isə bu haldan məyus olmuş kimi öz axarına qayıdır və axaraq yoluna davam edir.

Ağbulaq dağlarından mənbəyini götürən Alxaslı çayı Şeylanlı, Katos, Ağcakənd, Alxaslı, Qaraçanlı, Mişni, Sonasar, Hoçaz kəndlərindən keçərək Seyidlər kəndi yaxınlığında, “Qızıl evi” adlanan çay qovuşanda Şəlvə çayına qovuşur.

Yaz, yay aylarında üzünü görməyəsən bu çayların. Yaylaqlara, dağlara yağan yağış, sel suları qovuşaraq birə-beş çoxaldığı üçün, həmin çayların suyu cilov çeynəyən kəhər atlardan betər olurlar. Hələ hirslənəndə qarşısına keçən hər nə varsa qabağına qatıb, əndazədən çıxaraq haqqı, ədaləti, rəhmi

də yadından çıxardır, udurdular. Sanki, heç həmin sakit, lal axan, yanmış ürəkləri, susuzluqdan cadar-cadar olmuş dodaqları isladan su deyildi bu... Sanki, coşqun ləpələri, dalğaları, qayaların bağrını dəlməyə, parçalamağa çalışan bu deyilmiş. Su qovuşanda, Zabux kəndindən sonra Malxələf kəndinə, Qazıdərəsi kəndinə, Güləbird kəndinə tərəf axmağında, harasa tələsməyində davam edirdi.



Bəzən Şəlvə çayı ipə-sapa yatmayanda sakit axışı, ağ, şəffaf üzü də dəyişir sanki, qara – lilli üzünə baxmaq da istəmirsən. Fikirləşirsən ki, bu həmin sular deyilmiş. Minkənd çayı isə sakitcə öz axarında axmağında davam edirdi. Gözəlliyi ilə, şəffaflığı ilə ona "yanıqlıq" verərdi. Çay qovuşanda qara – lilli suya qarışmağa naz edərdi, ha çalışardı o tərəf, bu tərəfə axsın, ancaq bacarmazdı, qarışardılar, qovuşardılar...

Birdən də Minkənd çayının üzünü görməyəsən. Axı dağlara yağan yağışlar da elə bil növbə ilə yağırdı. Elə bil bir-birilərinin acığına bəhsləşirdilər.

Su həyatdır. Susuz canlıların yaşaması qeyri-mümkündür. Susuz insanlar da, təbiət də məhv olar, maraqsız, mənasız olardı. Belə gur su mənbələri insanların xeyirxah işlərinə kömək edir. Bundan ağıllı insanlar həmişə yaxşı məqsədlər üçün istifadə etmişlər.

Məlum olmuşdur ki, keçmişdə tarixi hadisələr baş verən zamanlarda da Makedoniyalı İsgəndər, Teymurləng dünyanın bir çox yerlərini işğal edərkən öz izlərini bu ərazilərdə də qoyub getmişlər.

Vaxtı ilə bu ərazidə (Laçın rayonu) yaşayan insanların yaşayışı üçün zəruri tarixi abidələr – yaşayış evləri, qəsrlər, məbədlər, qəbiristanlıqlar və su ilə işləyən dəyirmanlar yaranmışdır...

Su ilə işləyən dəyirmanların yaranması zərurəti onu sübut edir ki, burada yaşayan insanlar əkinçiliklə məşğul olmuşlar. Kol-kos basmış ərazilər daşlardan təmizlənmiş, yararlı hala salınmış, əkin üçün istifadə edilmişdir.

Əvvəllər hər bir su mənbəyinin üstündə, yaşayış məntəqəsinin yaxınlığında bir və ya iki qonşu kəndin su ilə işləyən dəyirmanı olardı. İki, üç dəyirmanı olan kəndlər də olmuşdur. Həmin kəndlər ən varlı kənd hesab olunardı, camaatın güzəranı yaxşı keçərdi. Birdən-birə yox oldu su ilə işləyən dəyirmanlar...

Kəndlərimizin keçmiş tarixinə nəzər salanda məlum olur ki, Şəlvə dərəsi (Hacısamlı kəndindən – Taxta zavodundan Qovuşuq kəndinə qədər olan ərazi) Hacı adlı bir varlının sahəsi olub. Burada onun döl-döşü, qohum-əqrəbası məskən salıbmış. O, çox varlı-hallı, ədalətli bəy imiş. Onun özünə görə qoşunu, dəstəsi, əkin sahələri, mal-qarası, at ilxısı varmış.

Keşik dağında Hacının keşikçi dəstəsi növbədə dururmuş, hansı tərəfdən yağı düşmən gəlsə imiş, keşikdə duran döyüşçülər yerlərə xəbər verərmiş.

Teymurləngin hücumuna (1401-ci il) tab gətirə bilməyən dəstə düşmənə məğlub olur, Hacıxan öldürülür. Şahın dəstəsi burada xeyli ləngiyir. Əhalinin var-dövlətini, olan-olmazını əlindən alır, sonra isə Naxçıvan istiqamətinə doğru hücumunu davam etdirir. Ağır itkidən sonra Hacıxanın oğlu Qara Bayram fəaliyyətə başlayır, gizləndiyi kənddən köçüb atasının adını daşıyan indiki Hacıxanlını abadlaşdırmaqla məşğul olur. Atasının var-dövlətini basqınçılar aparsalar da, o günü-gündən öz yaşayış tərzini nizamlaya bilir. Ata yurdunda yaşayır.

Hacıxanın nəvəsi, Qara Bayramın oğlu Süleyman yüzbaşının dövrünə qədər burada üç su dəyirmanı olmuşdur. Süleyman yüzbaşı ədalətli el ağsaqqalı kimi böyük hörmətə malik olub. O, Hacıxanlı kəndində öz vəsaiti hesabına Qara Bayramın adını daşıyan 2 su dəyirmanını təmir etdirərək işlək vəziyyətə salmışdır. Qarabağdan, Bərdədən su dəyirmanı üçün daş sifariş vermiş və Şəlvə dərəsinə gətirmişdir. 3-cü su dəyirmanı isə Məşədi Əsədin adı ilə bağlıdır...

O vaxtlar Hacıxanlı kəndi 30-40 ev olarmış. Qovuşuq, Budaqdərə, Şəlvə kəndi ilə birlikdə 1200 baş iri buynuzlu və 2000 baş xırda buynuzlu davar və 500 arı pətəyi varmış. Əkin-biçin də öz qaydasında təşkil olunarmış. Anbarlarda yer olmadığından taxıl əlavə mərəklərə yığılarmış. 20 il müddə-

tində Şəlvə dərəsindən heç bir kəs dolanışıq arxasınca başqa yerə getməmişdir.

Taxıl istehsalı artdığından Muncuqlu kəndində də su ilə işləyən yeni dəyirman inşa edilmişdir.

Qorğundağ (2396 metr), Sarıbaba (2230 metr) dağlarından axan Kalafalıq çayının üzərində Vağazin, Bozgüney, Kalafalıq kənd camaatı üçün Məhəmmədəlinin dəyirmanı, Ərdəşəvi, Haqnəzər kəndlərinin camaatı üçün Gülmalının dəyirmanı, Təzəkənd, Qozlu, İpək, Ayıbasar kəndlərinin camaatı üçün Qara Məmmədin su dəyirmanı, Pircahan, Seyidlər, Alıqulu kənd camaatı üçün Böyük çayın üstündə, körpünün yanında, Seyidlər kəndinin "Qızıl evi" adlanan ərazisində su ilə işləyən dəyirmanlar var idi.

Su dəyirmanı olan həmin kəndlər ən varlı kənd hesab olunardı, camaatın güzəranı yaxşı keçərdi. Birdən-birə yox oldu bu dəyirmanlar. Bu ucuz, səmərəli qurğulara indi yenidən maraq artmaqdadır. Muzeylərdə ancaq pərakəndə hissələrinə rast gəlmək olur, əyani vəsait kimi gənclərə qısa məlumatlar verilir.

Ona görə də dəyirmanın quruluşunu qələmə alırıq ki, onu bərpa etmək istəyənlər, maraqlananlar dəyirmanı tanısınlar və bu haqda geniş təsəvvür əldə etsinlər. Su dəyirmanı üçün çaydan, su axarında dəhnə basardılar, arx çəkib hündür tərəfindən dəyirmana enən nova bənd edərdilər. Su arxı hazır olandan sonra dəyirmanın binasının yerini ölçüb-biçərdilər. El qeyrəti, el təəssübü çəkən oğullar tez bir vaxtda qollarını çırmayıb binanı inşa edərdilər, bir neçə gündə su dəyirmanının binası istifadəyə verilərdi. Bina hazır olandan sonra ən kiçiyi 4-5 metr uzunluğunda nov düzəldilərdi. Nov ağacı davamlı olmalı idi. Nov ağacdan hazırlanardı. Möhkəm olması üçün bir neçə yerdən sağanaq bərkidərdilər ki, dağılmasın, su sızıb təzyiq aşağı düşməsin. Novun aşağı hissəsinin ucuna təzyiqi daha da artırmaq üçün dar lülə bağlayardılar.

Su dəyirmanı üçün daşları hazırlamağa bacarıqlı daş yonan bənnalar cəlb olunardı. Onlar ərazini axtarıb, möhkəm, davamlı daş süxurları tapardılar, eləcə də yerində dəyirman daşlarını müəyyən etdikdə, elə oradaca daşlar yonulardı. Daşları dəyirmana gətirmək üçün xüsusi xizək düzəldilərdi. Xizəyin üstünə ağacların qol-budağından döşəyib daşı möhkəm bağlayardılar ki, sürüşüb düşməsin. Xizəyi kələ, öküzə, ata qoşaraq su dəyirmanının yaxınlığına gətirərdilər. Daşları dəyirmana qoşmaq üçün xüsusi çarmıx düzəldilərdi. Həmin dəzgah möhkəm ağacdan düzəldilərdi ki, ağırlığa tab gətirə bilsin.

Üst və alt daş qalınlığı 20 sm olmaqla dairəvi şəkildə hazırlanardı. Onu götürmək üçün, yerini dəyişmək üçün yan tərəflərində oyuqlar düzəldər, oyuqlara dəmirdən "paz" yeridərdilər, çarmıxın qollarından asılmış, bərki-

dilmiş sağanaqların köməkliyi ilə daşlar bir-bir hərəkətə gətirilərdi. Yəni "çarmıx" dəzgahı dəyirmanın üst hissəsindən, millərdən asılardı ki, davamlı olsun. Dəzgahda, "çarmıx"da xüsusi sükan olardı ki, onu hərəkətə gətirən zaman yığılardı, açılardı, nəm taxıl üyüdən zaman üst dəyirman daşında "xamırlama" halı baş verir. Onda həmin "çarmıx" dəzgahın köməyi ilə üst daş qaldırılardı. Xüsusi dişli çəkiclə döyülərək təmizlənərdi.

Pər düzəltmək üçün şiş yonub hazırlayardılar. Şişin üst ucundan yarım metrdən bir 12 yuva açardılar, ona 8-10 santimetr enində, 1 metr uzunluğunda yonulub hazırlanmış taxta geydirilərdi, o biri ucunu da dəmir sağanağa bərkidirdilər. Su anbarı, – "donuzluq" da deyirlər, – adlanan yerdə novun qarşısında şişi, onun üstündə pəri quraşdırırdılar. Şişi yerdə daban ağacının üstünə oturdurdular. Daban ağacının tən ortasında şişin ucu oturmaq üçün yuva oyuq, həmin yuvaya bir ədəd yumru diyircək qoyulardı... Şiş diyircəyin üstündə qoyulur ki, su pəri hərəkətə gətirən zaman təzyiqə dözərək sərbəst işləyə bilsin. Daban ağacında xüsusi kərt yeri, oyuq və ağac olur ki, uc hissəsindən qaldırıb-endirmək asan olsun, sürəti artıra və azalda bilsinlər.

Pərin üstündə dəzgah qurmaq üçün 4 möhkəm ağacdan sütun basdırırlar. Dəzgahın üstündə dəyirmanın alt daşı yerləşdirilir. Alt daşın ortasında yuvacıq olur, hərəkətsiz olaraq qalır. Şişin ucu alt daşın ortasında yuxarı çıxarılır, xüsusi yer haça olur ki, ora dəmir ucluq salınır. Üst daşı şişə bərkidilir, həmin dəmirin yanları boş olduğundan taxıl oradan alt daşın üstünə tökülür, hərəkətə gələn zaman üst daş isə taxılı əzib un halına salır.

Daşların kənarına kərxota düzəldilir ki, ard unu dolduqdan sonra un təhnəyə axıb gedə bilsin... Ard unu daşın ətrafına dolan artıq una deyirlər. Kərxotanı daşın kənarına düzəldirlər ki, un kənara dağılmasın. Təhlükəsizliyi təmin etsin. Onun qarşı tərəfində un yeşiyi qoyulur ki, üyüdülən un həmin yeşiyə axıb dolsun, oradan isə un sahibi kisələrə yığsın.

Taxıl təhnəsi dəzgahın üstünə bərkidilir. Onun tutumu 100-200 kiloqram həcmində olur. Alt hissəsi maili düzəldilmiş olur ki, taxıl təhnəsinin altında dəncik qoyulsun. Dəncikdən çax-çax asılır ki, o da daşın üzərinə düşür, daş hərəkətə gəldikcə çax-çax hərəkət edir, onda dən müəyyən ölçü ilə tökülür. Azaltmaq və çoxaltmaq üçün onun xüsusi sükanı olur.

Dəyirmana gətirilən dən üçün şahad, yəni üyütmə haqqı alınardı. Hər 100 kiloqrama 2 küccə haqqı verilərdi. Küccə çanaqdır, ağacdan düzəldilən ölçü qabıdır, 2 kiloqram taxıl tuturdu.

Dəyirmanda buxarı qoyulması heç bir vaxt yaddan çıxmazdı.Yoldan ötən, dəyirmanda xeyli ləngiyən, qonaq gələn adamlar üçün dəyirmançı, yaxud da dən sahibi mütləq ocaq qalayıb buxarıda kömbə, fətir bişirərdi.

Dəyirmanda işlətmək üçün ağacdan düzəldilmiş təhnə olardı ki, onda xəmir yoğrulardı. Buxarının kənarında olan sal daşa xəmirdən hazırlanmış kündələri təndirə yapan kimi yapardılar. Bişib hazır olan kömbə, yaxud da fətiri mis dövrədə ortaya gətirərdilər. Kömbənin, fətirin tən ortasını oyub ora nehrə yağı qoyardılar, yağ çörəyin canına hopandan sonra yeməyə başlayardılar.

Pər olan yerə ona görə "donuzluq" deyərdilər ki, qaranlıq, səs-küylü və darısqal idi. Ora girib-çıxmaq çox çətin olardı. Vahiməli olduğuna görə belə deyərdilər, yəni donuz da ora girib-çıxmaqda çətinlik çəkər.

Dəyirmana üyütmək üçün aparılan taxıl, buğda, arpa və qarğıdalı dəni qabaqcadan hazırlanmalı idi. Taxıl xəlbirlə ələnər, təmizlənər, günün qabağında xeyli qurudulardı, toxunma kisələrə, çuvallara yığılardı, ulaqlara yüklənib dəyirmana daşınardı. Payız ayları tədarük olunardı ki, qışa hazır olsun.

Su dəyirmanında üyüdülmüş un həmişə keyfiyyətinə görə fərqlənmiş, əhəmiyyətli hesab edilmişdir. Mədə-bağırsaq üçün zərərli sayılmazdı.

Su ilə işləyən dəyirmanlarda üyüdülən unu çörək bişirmək üçün analarımız birinci ələkdən keçirərdilər ki, kəpək çörəyə qarışmasın, kəpəyi toyuq-cücəyə verər, kəpək unundan itə yal bişirərdilər.

Taxıl nəm olduqda dəyirmanın daşları xəmir bağladıqdan işləməzdi. Dəyirmanın işçisi onu təmizlədikdə fasilələr yaranardı. Ona görə də heç bir vaxt nəm taxılı dəyirmana aparmazdılar.

Məişətdə "kirkirə" adlı əl dəyirmanı ilə buğda üyüdülərdi, Novruz bayramında qovurğa qovrulardı. Yeyilməyib artıq qalan qovurğadan qovud çəkilərdi. Qovud əl dəyirmanı "kirkirə" ilə üyüdülərdi.

Qoca nənələrin dediyinə görə, meyvə çox olan zaman doğrayıb qurudardılar. Qışa hazırlıq üçün qurudulmuş daş armudunun qaxını, dağdağanın meyvəsini əl dəyirmanında üyüdərək şəkərlə, balla, doşabla qarışdırar, meyvə qovudu hazırlayardılar. Belə yeməklər insanların sağlamlığına kömək edərdi.



Ancaq hal-hazırda elm və texnikanın inkişafı insanların əl əməyini yüngülləşdirir. Su ilə işləyən dəyirmanlarımızın hissələri muzeylərin eksponatlarına çevrilib.

**Nemət BƏXTİYAR,**
**Azərbaycan Jurnalistlər Birliyinin üzvü**

**POEZİYA**



**Elnur İRƏVANLI**

## SAÇIM AĞARIR

Qəlbim inildəyir kaman, tar kimi,
Xoş günlər yan keçir məndən yar kimi.
Zirvənin başına yağan qar kimi
Ağarır, ay ana, saçım ağarır.

Çoxalır təlaşım, artır təhlükə,
Həsrətim dağ boyda, vüsal bir tikə.
Qayğılar başıma dən tökə-tökə
Ağarır, ay ana, saçım ağarır.

Hamıya uzaqdan görünən dağam,
Mən gərək özümə yaxından baxam.
Bəlkə indən belə ağ günə çıxam,
Ağarır, ay ana, saçım ağarır.

Bir oğul doğmusan talesiz, baxtsız,
Ürəyi saraydı, qalıbdı taxtsız.
Mən yazıq neyləyim – vədəsiz, vaxtsız,
Ağarır, ay ana, saçım ağarır.

Ömrüm boyu ipək gəzib, tapdım bez,
Gəl sən də, ay ana, bu bazarı sez.
Onu bilmədim ki, niyə belə tez
Ağarır, ay ana, saçım ağarır.

***08.08.2008***

## TƏBƏSSÜMÜ ŞƏKƏR, GÜLÜŞLƏRİ BAL



*Qızım Ayişənin 2 yaşının tamam olması münasibətilə*

Bu müqəddəs ayda, bu əziz gündə
Ad günün mübarək, Ayişə balam!
Üzü nur ziyalı, günəş şəfqətli,
Baxışları kövrək, Ayişə balam!

Təbəssümü şəkər, gülüşləri bal,
Pöhrələn sevinclə, sevgidən güc al.
Şərəflən, şöhrətlən, zirvəyə ucal,
Bizlərə ol gərək, Ayişə balam!

Atana, anana şipşirin nübar,
Gül açsın qismətin, qoy gətirsin bar.
Babalı, nənəli bir arzumuz var:
Səni xoşbəxt görək, Ayişə balam!

***16.07.2015***

**NƏSR**

## YARIMÇIQ YUXU

Xəfif əsən sərin meh saçlarını üzünə ləpələrin sahilə çırpındığıtək çırpır, sonra isə geri aparırdı... Məsum baxışların arxasında gizlənən badamı gözlər bir nöqtəyə zillənmiş, sanki ətrafdakı mənzərədən xəbərsizmiş kimi yönünü dəyişmirdi. Adındakı saflıq, gözəllik üzünə və qəlbinə hopmuşdu. Bu gün o, həmişəkindən də gözəl idi... Əynində uzun qırmızı don, kürəyinə tökülən gecə kimi siyah tellər və əlində xonça var idi. Qəlbində zamanın necə də tez ötdüyünü, hər şeyin kino lenti kimi gözünün önündən bir neçə saatda keçdiyini düşünərək sevinc qarışıq təlaşlı bir səslə yaşıl çəmənliklə üzüyuxarı gələn oğlunu səslədi: “Bala, tez ol, hər şey hazırdır. Maşınları qapıya gətirin, xonçamız çoxdur”, – dedi. Deyib-gülən bütün ailə, qohum-əqrəba şükür edərək qapıda duran maşın karvanına doluşdular. Maşınlar yerindən tərpənərək, Qırxqız dağlarının ətəyində yerləşən bu füsunkar kəndin yolları ilə hərəkətə başladı. Maşınların tərpəniş səsindən gözləri yavaş-yavaş açılırdı. O səs qəflətən soyuq bir otağın qapı cırıltısı ilə əvəz olundu. Ayılmaq istəmirdi, amma artıq çox gec idi...

İti addımlarla ona yaxınlaşan düşmən əsgərlərinin yanındakı bir yabançı Qırmızı Xaç Cəmiyyətindən gəldiyini və ondan yaxınlarına məktub yazıb-yazmayacağını soruşdu. Ayağından aldığı yaradan qaynaqlanan ağrının acısı baxışlarından oxunsa da, özünü güclə toplayaraq əli ilə yazacağını işarə etdi. Yazacaq söz çox idi. Lakin söz ilə anladılması çətin olan tükürpədici hisslər də var idi qəlbində. Yurdunun övladlarına təhsil vermək üçün keçdiyi dərslərdə həvəslə təbaşiri lövhəyə vuran o əllər indi əsərək qələmi güclə tutmuşdu. Gözündən dayanmadan axan yaşlar, titrəyən barmaqlar, bütün bədənini saran o dəhşətli ağrı, izahı çətin düşüncələri yazmaq qorxusu və günlərdir xəbər tutmadığı əsirlikdə olan 1 yaşlı körpəsi, daha nələr, nələr...

Vətən nisgili, ailə faciəsi, qardaş ölümü, əsirlikdə olan digər qardaşının, balasının və nəvəsinin acısı ilə qovrularaq otaqda pərvaz edən, gözləri yollarda qalmış bir ananın qapısı döyüldü. Amma gələn övladı deyil, ondan gələn məktub idi... Yaşlı gözlərlə oxuduğu məktubda qızı Səma artıq geri dönməyəcəyini, daha doğrusu, əsirlikdə olmuş bir qadın kimi geri dönmək istəmədiyini yazmışdı. Əslində ana bunu öncədən duymuşdu, axı o verdiyi tərbiyəyə, qızının əxlaqına və Azərbaycan qadınının rəşadətinə gözəl bələd idi... Lakin analıq hissindən doğan kiçik bir ümid balasının bir gün dönəcəyinə inandırmışdı onu... Səma o soyuq otaqda taqətsiz halda yatağına sə-

rilmiş, ayağındakı ağrının acısı ilə qıvrılırdı. O, gözlərini qapayıb yarımçıq qalmış yuxusunun ardını görmək, xəyalən də olsa belə kəndlərinə, oğlunun nişan mərasimi olduğu günə qayıtmaq istəyirdi. Amma bu mümkünsüz idi. Əsirlikdə olarkən ayrı düşdüyü bir yaşlı körpəsi Nurlanə xəyalından bir an belə çıxmırdı. Nifrət etdiyi bir yerdə insana hər şey dözülməz gəlir, o qapının pis cırıltısı kimi... Bu dəfə açılan qonşu otağın qapısı idi. Alçaq düşmənin gülüş sədası otaqdan sürüdülərək çıxardılan qadının naləsinə qarışmışdı. Nalə göylərdə fəğan edir və o nalə ucaldıqca, namusumuz, ləyaqətimiz alçalırdı. Ən acısı isə, oradakı hər bir qadın belə bir günün onlar üçün də gələcəyini gözəl bilirdi...

Gecənin qaranlığında Səma ehmalca ətrafa boylandı. Vahimə içərisində idi, qonşu otaqdakı qadının naləsi hələ də qulaqlarında cingildəyirdi. Qəflətən nə düşündüsə, əlini günlərdir daraq dəyməyən, qanla, palçıqla qarışan saçlarına apardı. Əlinə saç sancağı dəydi. Bunu ona rəhmli Allahın yetirdiyini düşünərək sevindi. Bəli, o artıq qərarını vermişdi, şərəflə ölməyi düşmən əlində əsir olmaqdan üstün tutaraq, saç sancağı ilə damarını kəsdi. Qan itirdikcə taqətdən düşür, bənizi avazıyır, gözləri yumulur və xəyalında yenə həyatının ən xoşbəxt günü, oğlu Rüfətin nişan mərasimi canlanırdı. – “Üzükləri götürdükmü, ay Nurlanə? – deyə Səma qızından soruşdu. “Axı insan həyəcanlı olanda unutqan olur”. Maşın karvanı mənzilə çatdı... O, həvəslə maşından enib dərindən nəfəs aldı. Bütün qohum-əqrəbası əhatəsində idi, hamının simasında sevinc hissi duyulurdu. Bu gün hamı ona bir başqa əziz gəlirdi. Boylanıb oğlu Rüfətə və qızı Nurlanəyə sarı baxdı. Birdən hər tərəfə qaranlıq çökdü. Çox istəsə də ardını görə bilmədi... O xəyalın xoş hissləri ilə gözlərini onun üçün amansız olan bu dünyaya əbədi olaraq yumdu. Ömrünün 23-cü baharında həyatı kimi yuxusu da yarımçıq qaldı. Səma şəhid oldu və ondan geriyə oğlu Rüfət, ermənilərin dünya işığından məhrum etdiyi qızı Nurlanə və gələcək nəsillərin də unutmayacağı ölümün gözünə dik baxan mərd bir türk qadınının acı həyat hekayəsi qaldı...



**Şəbnəm CƏBRAYIL**

**POEZİYA**



**Yadigar HƏŞİMOV,**
**Laçın rayonu, Mişni kəndi**

## HƏSRƏTİNDƏYƏM

Könlüm arzulamır nə çəmən, nə bağ,
Nə geniş bir düzən, nə uca bir dağ.
Hicran ürəyimi eyləyib dağ-dağ,
Bir kiçik təpənin həsrətindəyəm.

Nə çay istəmirəm, nə zor bir dərə,
Bir sısqa su üçün yannam min kərə.
Aludə deyiləm qızıla, zərə,
Bir ovuc torpağın həsrətindəyəm.

Alıb başım üstün duman, boran, çən,
Yüz bağça-bağ ola, könlüm olmaz şən.
Öz doğma yurdumda saralıb düşən
Bir quru yarpağın həsrətindəyəm.

İtkin düşüb çal-çağırlı hörüşüm,
Orda qalıb təbəssümüm, gülüşüm.
Qismət olsa bir də geri dönüşüm,
Çöllərə baxmağın həsrətindəyəm.

Gəzəydim bir dəfə cığırlarında,
Bir ocaq çataydım çay qırağında.
Kəklik qaqqıldaşan qayalarında
Gəzməyə çıxmağın həsrətindəyəm.

Baxaydım Laçından “Hoçaz daşı”na,
Çıxaydım “Qırxqız”a, “Pir”in başına.
Düşüb o dağlarda yaz yağışına
Bir ilham almağın həsrətindəyəm.

Həqiqət doğaydı kaş bu gümandan,
Olmazdı inan ki, dərdim o andan.
Yadigar, döz hələ, usanma candan
Düşməni yıxmağın həsrətindəyəm.

## KİMİ

***Dostum Osman müəllim***
***bizə gəlmişdi***

Yox oldu qəlbimdən kədər bu axşam,
Səmadan buludlar yox olan kimi.
Gələydin həmişə kaş belə qardaş,
Dərd-qəm ürəyimdə çoxalan kimi.

Hicran yükü çoxaldıqca canımda,
Ən çətin günümdə, ağır anımda.
Görəydim durmusan gəlib yanımda,
Həsrətdən ürəyim sıxılan kimi.

Coşqun selə dönüb axdım bu axşam,
Odlu şimşək olub çaxdım bu axşam.
Bərdədən Laçına baxdım bu axşam,
Laçının özündən baxdığım kimi.

Mişnisiz qan verən yaram sağalmaz,
Laçınsız nisgilim, qəmim azalmaz.
Dağlar həsrətilə yanan tapılmaz,
Bu Yadigar yanıb-yaxılan kimi.

## BU GECƏ

Yuxuda getmişdim kəndə bu gecə,
Sındırıb sal buzu mən su içirdim.
Bilmirəm olmuşdu axı bu necə?
Keçilməz yolları rahat keçirdim.

Yuxuda getmişdim kəndə bu gecə,
Getmişdim yüz ilin həsrətlisitək.
Bağrıma basmışdım sal qayaları,
Ən əziz, mehriban istəklilərtək.

Yuxuda getmişdim kəndə bu gecə,
Çayın kənarında gəzirdim yenə.
Bir daşın üstündə qızıl balığı
Oturub çubuğa düzürdüm yenə.

Yuxuda getmişdim kəndə bu gecə,
Həsrəti bir anlıq unutmaq üçün.
Doğma vətənimə, yurda qovuşub
Gözümün yaşını qurutmaq üçün.

## AYNİŞANIM

*Nəvəm Aynişanın 3 yaşı tamam oldu*

Yığılıbdı bu gün bura, ata, ana, baba, nənə...
Təbrik edir hamı sənin Ad gününü dönə-dönə.
Ən xoş günlər, uzun ömür arzulayır baban sənə.
Günüm, ayım, ilim mənim, ey həyatım, qəlbim, canım,
Gözlərimin nuru mənim, ay balaca Aynişanım.

Nur saçırsan evimizə, ailəmizin sevincisən,
Ləl-cəvahir, gövhər nədir, sən əvəzsiz bir incisən.
Gözəl-göyçək çiçək çoxdur, sən hamıdan birincisən.
Günüm, ayım, ilim mənim, ən sevimlim, mehribanım,
Gözlərimin nuru mənim, ay balaca Aynişanım.

Böyü, ali məktəb qurtar, səsin gəlsin zirvələrdən,
Xoşbəxt yaşa ömür boyu, uzaq ol qəmdən, kədərdən.
Qorusun o Tanrı səni, hər an qəzavü-qədərdən.
Günüm, ayım, ilim mənim, damarımda axan qanım,
Gözlərimin nuru mənim, ay balaca Aynişanım.

Nurlu olsun gələcəyin, xoş keçsin hər günün, ayın,
Bəxt ulduzun parlaq olsun, uzun olsun ömür payın.
Səninlə fəxr eyləsinlər – atan, anan, əmin, dayın...
Sən güləndə sevinirəm, onda olur ən xoş anım.
Gözlərimin nuru mənim, ay balaca Aynişanım.

**KİTAB RƏFİ**

**Eldar İSMAYIL,**
***Şair-yazıçı, əməkdar jurnalist***



## SÖZÜN GÜCÜ SÖZ DEYƏNDƏDİ

Gənc şair Gündüz Əhmədli çapa hazırladığı "Qaranlıqda işıq" şeirlər kitabının əlyazmasını utana-utana mənə təqdim etdi:

– Əmi, bu şeirlərə bir bax, gör hələ kitaba yararlıdırmı? – deyə mənə bir qovluq verdi.

– Baxaram, – dedim, inşallah, yaxşı olar.

İlk başdan "yaxşı olar", – deməyim təsadüfi deyildi. Gündüzün internet səhifəsində və tədbirlərdə şeirini oxuyub görmüşdüm.

Həm də Gündüz hələ üçüncü, dördüncü sinifdə oxuyanda bir küncə çəkilib qələm əlində nə isə yazıb-pozardı.

– Gündüz, nə yazırsan, – deyə soruşanda uşaq təxəyyülü ilə deyərdi:

– Roman yazıram, şeir yazıram. Onun bu sözünə çox vaxt gülüşərdilər, müşahidə qabiliyyəti get-gedə üzə çıxırdı. O, həyat hadisələrini qeyri-adi bir maraqla izləyir və öyrənməyə meyil edirdi.

Azərbaycan, Türk klassiklərini mütəmadi oxuyur, dünya ədəbiyyatına maraq göstərirdi. Bu gün də həmin istək, həmin maraq davam etməkdədi.

Oxuduğu ali məktəbdə ingilis dilində və türk dilində aldığı təhsil, çağdaş dünya və türk ədəbiyyatını orijinaldan mütaliə etməsi Gündüzün bu sahədəki işini bir qədər də asanlaşdırmışdır. Dünya ədəbiyyatının hansı istiqamətdə inkişaf etdiyini ardıcıl olaraq izləyə bilib. Bu da onun əsərlərinin bədii-estetik dəyərində, fəlsəfi məziyyətlərində özünü göstərir. İnsan və insanlıq, yaşam və ölüm kimi bəşəri dəyərlər gənc şairin yaradıcılığından qırmızı xətlə keçir:

*Bir vaxtlar gəzdiyin küçələrdəmi*
*İtirdin ən şirin xatirələri...*
*Bu yalan dünyanın pəncərəsindən*
*Neçə insan baxdı Adəmdən bəri.*

Gündüzün "Bir gün insanlıq düşəcək yada" şeirindəki motivlər, deyim tərzi özündən əvvəl yazılan şeirlərdən bədii-fəlsəfi məziyyətinə görə seçilir. Ümumiyyətlə, gənc şair qələmə aldığı hər mövzuya öz təxəyyülü, öz fəlsəfi dünyagörüşü ilə yanaşır və qarşısına qoyduğu məqsədə nail olur.

Dünyada axıdılan günahsız insan qanlarına, o cümlədən Suriyada öldürülən uşaqlara rəğmən Gündüz bir gün insanlığın yada düşəcəyinə ümid edərək yazır:

*Bir gün insanlıq düşəcək yada,*
*Bir gün dəb olacaq vicdan dünyada.*

Vicdan məsələsi hər vaxt, hər zaman qələm sahiblərinin yaddan çıxmayan mövzusu olmuşdur. Hər sənətkar da bu mövzuya öz yaradıcılıq prizmasından yanaşmışdır. Lakin Gündüzün poeziyasındakı "vicdan" yenidir, təzədir...

Gənc şairin şeirlərində biz insan və dünya faktoruna tez- tez rast gəlirik. "Hər bir yaranmışın bir yaradanı var" – deyən şair insanları dünyanın qədir-qiymətini, eləcə də yaşadığı hər günün, hər saatın dəyərini bilməyə çaığırır. İnsan dünyaya bir dəfə gəlir, ikinci dəfə gəlməyə haqqı yoxdu. Çünki nə yaşasa o ömür onun imtahan müddətidir. Bu mənada Gündüzün "Göylər bizi bağışlamaz" hekayəsi olduqca ibrətamiz bir sənət nümunəsidir.

Gündüz Əhmədlinin yaradıcılığında günün aktual məsələləri, dünya hadisələrinə münasibət, ölkəmizdəki yeniliklər diqqətdən yayınmır. Mövzu əlvanlığı diqqət çəkir. Qarabağın, Göyçənin, Zəngəzurun işğalı gənc şairi narahat edir. Araza üz tutaraq deyir:

*Bu milləti bölüb iki,*
*Düşmənlər diləyə yetdi.*
*Nə günahın sahibisən? –*
*Xainlər namərdlik etdi,*
*Xatada sən qaldın, Araz!*




Milləti oyaq olmağa çağıran gənc şair bir qədər də ərkyana və hiddətlə səsini qaldırır:

*Bu həsrət çox çəkməsin,*
*Milləti oyatmalı, –*
*Eşidin, ey insanlar,*
*Qarabağ qayıtmalı!*

Gənc şairin bir-birindən dəyərli şeirləri çoxdur. Gündüzün yaradıcılığında üstünlük ondadır ki, hər hansı şeirində yeni söz, yeni fikir özünü göstərir. İlk yaradıcılıq nümunəsi olaraq kitaba daxil edilmiş şeirlər arasında zəif misralar, deyimlər də vardır. Mən inanıram ki, Gündüz savadı, biliyi və coşqun ilhamı ilə seçilərək bu kitabından sonra böyük yaradıcılıq yolunda öz sözünü deyəcək...

**NOSTALJİ**



**Sayad QARAYEVA,**
***Laçın rayon 7 №-li tam orta məktəbin ibtidai sinif müəllimi***

## YADA DÜŞƏR XATİRƏLƏR

Dan yeri sökülürdü. Artıq səhər olmuşdu. Quşların cəh-cəhi, xoruzların banlaması, itlərin hürüşməsi eşidilirdi. Bütün bunlar adamı valeh edirdi. Hələ sübh tezdən təmiz havanı udmaq, buz kimi su ilə əl-üzünü yumaq, ətrafın sözlərlə ifadə oluna bilməyən əsrarəngiz gözəlliklərini demirəm.

May ayı idi. Uşaqlarla tez-tez təbiətin qoynunda istirahət edib oynayardıq. Günlərin bir günü uşaqlarla qərara gəldik ki, "Ər təpə"nin başına çıxaq. Oradan kəndimiz (Mişni), qonşu kəndlər (Qaraçanlı, Mirik, Bozlu, Quşçu, Sadınlar, Qoşasu, Bülüldüz, Soyuqbulaq) ovcumuzun içi kimi görünürdü. "Ər təpə"nin başına çıxdıq. Kəndimiz necə də gözəl görünürdü. Aran rayonlarında olan heyvanları çobanlar bizim yaylağa dağlara aparıb saxlayırdılar. Çünki həmin yerlər heyvanlar üçün çox əhəmiyyətli idi. Biz "Ər təpə"nin başına baxanda "El yolu" deyilən yerdən qoyun sürüləri, çoban itləri, dəvələr keçirdi. Qoyun-quzuların mələşməsi, atların kişnərtisi həzin musiqiyə bənzəyirdi. "Ər təpə"nin başında oturub "El yolu"ndan keçən qoyun sürülərinə xeyli tamaşa etdik. Çobanlardan biri isə məlahətli səslə oxuyurdu.

"Ər təpə"nin başında böyük daşlar var. Həmin daşların üstünə çıxıb səmaya baxmaq hər oğulun işi deyil. Həmin daşların həsrəti ilə yaşayırıq. O yerlərin gözəlliyinə, saflığına ermənilər haram qatıb. Ən böyük arzum həmin daşın üstünə çıxıb səmaya doyunca baxmaq, doymadığım kəndin havasını ciyərlərimə çəkmək, var səsimlə qışqırmaq, hayqırmaqdır.

### Dünya görmüş nənəmin söylədikləri

Nərmin 4-cü sinifdə oxuyurdu. O, təbiəti çox sevir. Həyat bilgisi dərsi idi. Müəllim təbii bitkilərin əhəmiyyətindən danışdı, əyani olaraq onları göstərdi. Uşaqlara tapşırdı ki, təbii bitkilərin xeyrindən necə istifadə olunma qaydalarını evdə böyüklərdən məlumat toplamaqla məruzə yazsınlar.

Dərs qurtaran kimi Nərmin evə gəldi. Yeməyini yedi, bir az istirahət etdi. Anasından icazə alıb nənəsigilə yollandı. Nənə nəvəsinin gəlişinə çox sevindi. Aradan bir müddət keçdikdən sonra Nərmin nənəsindən xahiş etdi ki, ona təbii dərman bitkilərindən danışsın. Nənə çox böyük məmnunluqla danışmağa hazır idi. Çünki nənə saf suyu, təbii bitkiləri, təmiz havası ilə məşhur olan Laçın rayonundan idi.

Hə, mənim balam. Heç bilmirəm haradan başlayım. O, yerlərin hər bitkisi, otu, daşı belə dəyərli idi.

Kəklikotu, qantəpər, zirə, ətotu, qırxbuğum, cincilim, gicitkən, itburnu çiçəyi , bağayarpağı, dəvədabanı, qırpizik, xincilavız, zirinc və sairə.

Qırxbuğum çox xeyirli, faydalıdır. Azərbaycanda qırxbuğumun 27 növünə rast gəlinir. Qırxbuğumdan istifadə etmək böyrək daşlarının tökülməsində xüsusi əhəmiyyət kəsb edir. Qırxbuğumu qurudub qış fəslində də işlədirlər. Qırxbuğumlu plovun ləzzəti, dadı hələ də damağımızdadır. Əvəlik, gicitkən də çox faydalıdır. Əvəlikdən hazırlanmış xörəklər soyuqdəymənin dərmanıdır. Əvəliyin yarpaqları yeyilir, kökündən isə boyaq hazırlamaq üçün istifadə edirdilər. Əvəlikli umacı heç bir yeməyə dəyişmərəm.

Mənim sevimli nəvəm, bizim yerlərin nəinki bitkiləri, daşı-kəsəyi də dəyərlidir. Bizim yerlər təbii dərman bitkiləri ilə o qədər zəngin idi ki, insanlar xəstəlik nə idi bilmirdilər. Ona görə də Laçın rayonunun ərazisi uzunömürlülər diyarı idi.

Kol dibindən bənövşəni,
Həm nərgizi, yasəməni,
Yaddan çıxartma laləni,
Dəstə bağlayıb, dər, gətir.

Qırmığın mərtəbilini,
Yemişanını, ləpirini.
Zirincini, əzgilini,
Dəstə bağlayıb, dər, gətir.

Qantəpəri, kəkotunu,
Zirəsini, ətotunu.
Dərdlərə dərman otunu,
Dəstə bağlayıb, dər, gətir.

Cincilimi, gicitkəni,
İtburnunun çiçəyini,
Həm yarpızı, həm nanəni,
Dəstə bağlayıb, dər, gətir.

Dağların çən-dumanından,
Qırxqızın donmuş qarından.
Şiş uclu buz salxımından,
Dəstə bağlayıb, dər, gətir.

## Sonsuz arzular

Çox gözəl bir yerdə, məkanda ürəyi arzularla dolu balaca bir qız yaşayırdı. Bu balaca qızın arzuları, istəkləri özü ilə birgə addımlayırdı. Firavan həyat sürürdü. Onun atdığı ilk uğuru 1-ci sinfə getdiyi gün idi. Arzularını gerçəkləşdirmək üçün oxumağı qarşısına məqsəd qoymuşdu.

Onun yaşadığı mühit həddən ziyadə rəngarəng idi. Bu rəngarənglik uşaqlıq illərini daha maraqlı, yaddaqalan edirdi. Hər günün, hər dəqiqənin, hər saniyənin öz gözəlliyi vardı. Bu gözəllikləri, sərbəstliyi ona təbiətin füsunkarlığı verirdi.

İnsan qayğısız, rahat, dinc yaşayanda, bütün insanları xoşbəxt görəndə yaşamaq, qurmaq, yaratmaq istəyir. Xalqına layiqli, dəyərli, onun çiçəklənməsi üçün əlindən gələni etməyə hazır olur.

Həmin balaca qız orta məktəbi müvəffəqiyyətlə bitirdi. O, ali məktəbə qəbul olmaq üçün Bakı şəhərində imtahan verməyi səbirsizliklə gözləyirdi. Ali təhsilini başa vurandan sonra isə öz doğma yurduna qayıtmağı, orada çalışmağı çox istəyirdi. Amma...

1992-ci ilin may ayından başlayaraq o qızın arzuları da, yaşamaq həvəsi də azaldı. Onun qismətində qaçqın kimi yaşamaq da varmış. O da digər qaçqınlar kimi öz yurdundan, ev-eşiyindən, gözəllikdə tayı-bərabəri olmayan Laçınından ayrı düşdü. Axırıncı dəfə kənddən çıxanda sanki ürəyinə dammışdı ki, uzun müddət oranı görməyəcək. Yol boyu o yerlərə acgözlüklə tamaşa edirdi. Yaşadığı evdən bir gün belə ayrı qala bilməyən qızın quru torpaq çatlayan kimi dodaqları çatlamışdı. Dodaqlarından qan axırdı. Ürəyini bu torpaqlara tapşırıb gedirdi.

Onun ən böyük arzusu Bakıda oxumaq idi. Amma o qaçqın kimi oraya gəldi. Hər şey onun gözündə kiçilməyə başladı. Rastlaşmadığı çətinliklərlə qarşılaşdı. Yaşamağa ev, hətta ev əşyaları belə yox idi. Çox acınacaqlı, çox cansıxıcı günlər idi. Valideynlərinin min bir əziyyətlə tikdikləri ev-eşikdən, bağ-bağçadan uzaq düşmüşdü. Hətta bir hadisə onun heç vaxt yadından çıxmayacaq. Səhər yeməyi üçün özünə çay süzdü. Şirin çay etmək üçün qaşıq axtardı. Axtardığını tapmadı. Valideynlərini üzməmək üçün çayın soyumağını gözlədi. Əlini yuyub barmağı ilə çayını qarışdırdı. Bu hadisədən xeyli vaxt keçdi. Dövlət evlə, işlə təmin etdi. “Kaş heç nəyimiz, hətta evimiz belə olmasın, amma kəndimizə qayıdaq”, – dedi.

Həyatın çətinliklərinə sinə gərməyi, daha iradəli, qətiyyətli olmağa çalışır. Ayaq üstə yenidən dayanmaq, o yerlərə ayaqyalın getməyə belə hazırdır. Dövlətimizin apardığı siyasətə, azərbaycanlıların birliyinə inanır. Kaş o yerlərə bir də qayıdam deyir. Amin!

Qismətimə qaçqın kimi,
Yaşamaq da düşdü, Allah!
Vətənimdə yurd-yuvasız,
Yaşamaq da düşdü Allah!

Düşərəm yolun izinə,
Heç nə görünməz gözümə.
Torpaq güc verər dizimə,
Torpağımdan güc alaram.

Ocağımdan od alaram,
Dağlarımdan qar alaram.
Doğulduğum o torpaqdan,
Güc-qüvvət alaram.

Laçınıma qovuşmasam,
Vətənimə qovuşmasam.
Bu dünyadan o dünyaya,
Yaman nigaran gedərəm!

***10.09.2015***

**DÜNYA ƏDƏBİYYATI**

**Robin ZİGER**

## ZƏFƏR ÜÇÜN DOĞULANLAR
**(davamı)**

### GÜVƏN

Güvən, ya da onun yoxluğu, başqalarında hamımızın görüb tanıya bildiyi bir şeydir və əgər özümüzə qarşı dürüstüksə, gerçəkdən güvənli olub-olmadığımızı bilirik. Bu, konkret bir keyfiyyət, inkişaf etdirə biləcəyiniz və bunu etməyiniz gərəkən bir şeydir. Bir şəxs olaraq özünüzü güvəninizi artırmağa odaqlamağınız (həsr etməniz) gələcəyə edəcəyiniz böyük bir yatırımdır.

Özünüzə inamınız özünüzlə bağlı hiss etdiklərinizin birbaşa göstəricisidir. Özünüzlə olan münasibətiniz sahib ola biləcəyiniz ən önəmli münasibətdir. Bu, digər münasibətlərinizi üzərində qura biləcəyiniz bir təməldir. Kiminsə güvəndən (özünəinamdan) məhrum olduğunu söyləmək, onun şəxsiyyətində bir qüsurun, uğurları əngəlləyən təbii bir əskikliyin olmasına işarə etmək deməkdir. Bununla birlikdə güvən, gücümüz çata biləcək bir şeydir. Onu inkişaf etdirə, gücləndirə və gələcəyimizi yaratmaqda ondan istifadə edə bilərik. Özünüzə inam qabiliyyəti güvəninizin özülüdür və normal təcrübələr, çalışmalar yolu ilə onu gücləndirməyə təkan verir.

***Bir inanc yalnızca elə zehnin sahibləndiyi bir fikir deyil, o, zehnə sahiblənən bir fikirdir.***

**Robert Bolton**

Heç danışmaqda olan bir uşağa fikir vermisinizmi? Uşaqlar heyrətamiz dərəcədə özlərinə arxayındırlar. Bir yığın yadellinin qarşısına çıxa bilərlər, çünki hələ qorxmağı öyrənməmişlər. Başqalarının münasibəti onları maraqlandırmaz, özləri ilə bağlı nikbin görüşləri vardır. Özlərinə qarşı anormal, mənfi münasibətləri yoxdur. Bazara yeni daxil olmuş şirkətlər də çox vaxt özlərinə əmin bir arxayınçılıqla işə başlarlar, hələ yeni, ehtiraslı və enerji ilə doludurlar. Ancaq güc qazandıran güvənlə ölümcül özündənmüştəbehlik arasındakı cizgi bəzən çox nazik olur və aradakı fərqi ayırd etmək lazım gəlir.

***Aerodinamika nəzəriyyəsinə görə, iri arı uça bilməz. Çünki qanadlarının açılış sahəsinə nisbətdə bədəni, ağırlığı və vücud forması uçmasını imkansız edər. Fəqət bütün bu intəhasız elmi gerçəklərdən xəbərsiz olan iri arı öz işində olar və hər şeyə rəğmən uçar; üstəlik, hər gün bir az bal da belə hasil edər.***

**Anonim**

Amma siz heç də gedib Everest dağına dırmanmağınız gərəkdiyini düşünməyin. Hər birinizin özünə görə çıxılacaq bir Everesti vardır, sizinkinin nə olduğunu da siz bilərsiniz. Zirvənizi özünüz bəlliləyin və onu fəth etməyə hazırlaşın. Önəmli olan özünüzlə bağlı şübhələri kontrol altına almaqdır. Hər kəsin şübhə və tərəddüdlərlə dolu belə anları yaşadığını bilin və onlardan qorxmayın, ya da sizi iflic etmələrinə izin verməyin. Mənfi düşüncənin qərarınızı baltalamağına əsla imkan tanımayın. Normal bir özünəinam və bacarma qərarlılığı mütləq daim ona dov gələcəkdir.

Bizlər önyarğısız (xurafatlarsız) və potensialımıza kənardan qoyulan heç bir sərhəd olmadan doğuluruq. Təbii zorluqlar və əngəllər qarşısında həyatda qalmağı bacarmağa genetik olaraq şərtlənmiş şəkildə gəlirik dünyaya. Bu dünyaya zəfər üçün gəlirik.

***Qaranlıqdan qorxan bir uşağı bağışlamaq asandır, həyatın gerçək faciəsi yetişkinlərin, böyüklərin işıqdan qorxmasıdır.***

**Əflatun (m.ö. 427-347),**
***yunan filosofu***

Uşaqlar elə bir xəyal gücü, elə bir daxili inamla doğulurlar ki, öz zehinlərində minlərcə macəranın qəhrəmanı olurlar. Düş (xəyal) gücü və güvən təşviq edildiyi zaman hər şey mümkün görünür. Ona xor və yaxud laqeyd

baxıldığı zamansa uşaq bütün həyatı boyu sürəcək bir zərərə uğramış olar. Uşaqların baxımsız, təşviqsiz, sevgisiz qaldığı Üçüncü Dünyanın məhrumluq səhnələrini və Rumıniya yetimxanalarını faciəvi televiziya filmlərindən görmüşük. Uşağın düş gücü inkişaf etdirilməsə, ona fitri verilmiş güvəni, özünəinamı bəslənməzsə, şəxsi uğur yaddaşı və bununla bağlı şəxsi güvəni də olmayacaqdır. Yaşlandıqca, kiçikkən bizə bacarığımızla bağlı qəti bir inam vermiş bu keyfiyyətləri unudur, onlara gerçək bir dəyər vermirik.

Dolayısıyla içinizdəki o uşaqla təmas qurun. O heyrət duyğusunu və hər şeyin mümkün olduğuna inamı təkrar hiss edin. Axı uşağın istinad yeri xəyal gücü və əzmi, qərarlığıdır. Uşağın güvəni öymə və müsbət təcrübə ilə necə böyüyürsə, sizinki də eynən elə olacaqdır.

Bir əkslik, kəclik olduğu zaman özünüzü onunla eyniləşdirməyin. Buna yalnızca dəf olunacaq bir şey kimi baxın.

***Tez-tez uğursuzluğa uğrayın, sıx-sıx başarısızlığa məruz qalın.***

**Tomas Vatson (1874-1956),**
***İBM-in qurucusu***

Başınıza pis bir şey gəldikdə – bir könül məsələsi fənaya uğradıqda, bir iş planı suya düşdükdə və ya bank anidən verdiyi krediti geri tələb etdikdə – bunu özünüzə dərd edib qala bilərsiniz. Özünüzü bu uğursuzluqla eyniləşdirə, sonrakı bütün ömrünüz boyu onu eynilə zəhlətökən bir yük kimi belinizdə daşımağa qərar verə bilərsiniz. Fəqət əgər bu mənfi xatirələri və onlarla bağlı olan duyğuları içinizdə tutar və onların mənlik, şəxsiyyət obrazınıza xələl gətirməsinə izin verərsinizsə, onda əldə edəcəyiniz yeganə şey özünüzü əngəlləmək olacaqdır. Bunun əksini etmək də elə sizin ixtiyarınızdadır. Təcrübədən dərs alın, sonra onu geridə buraxın. Başqa bir deyişlə, yükü çiyninizdən yerə atın.

***Razılığınız olmadan heç kimsə özünüzü əhəmiyyətsiz, fərsiz biri kimi hiss etmənizə yol aça bilməz.***

**Eleanora Ruzvelt (1884-1962)**



***Səlcuq türkcəsindən uyğunlaşdıranı:***
**Yusif OTAYLI**

**POEZİYA**

**Namiq ZAMAN**



## SƏNİ DÜŞÜNÜRƏM, VƏTƏN...

Anamın anası – vətən,
Atamın atası – vətən!
Əlimmi çatası, vətən,
Ünümmü yetəsi, vətən?!
Köksünü öpüb ötən
O küləyin, o mehin,
Otlarının ruhuna
Sərinlik verən şehin
Yerinə mən olaydım...
Adicə yarpaq kimi
Bir ağac budağında
Saralaydım, solaydım,
Ömrü başa yetirib,
Sinən üstə qonaydım,
Tapdanıb əziləydim.
O saf sularınsayaq,
Daşların arasından
Axaydım, süzüləydim...

Süzəydim göylərində,
Dönüb şahin quşuna.
Qonaydım o vüqarlı
Dağlarının başına.
Qurban olum, ay vətən,
Torpağına, daşına!..
Qədrini bilməyənlər
Talan etdilər səni,
Viran qoydular səni,
Nələr gəldi başına?!!
Bu qəmli çağlarımda
Qarışıb göz yaşına,
Sellənib axa-axa,
Gözünə baxa-baxa
Yuyaydım günahımı,
Bəlkə onda duyaydın
Bu naləmi, ahımı...

Bağrı yansın, bağrını
Yandıran yağıların,
Bizə didərginliyi
Qandıran yağıların.
Bizə öz haqqımızı
Dandıran yağıların –
Verərdim cəzasını,
İmkan olsa əlimdə...
Qoy bilsin bilməyənlər:
Atanın öz yeri var,
Ananın öz yeri var,
Gecə-gündüz, ay vətən,
Dilimdəsən, dilimdə...

Sənsiz hər an zülümdə,
Borandayam, qardayam,
Çox vaxt özüm bilmirəm
İndi kiməm, hardayam.
Tək onu bilirəm ki,
Sıxıntıda, dardayam!

Düşündükcə o ötən
Şən, qayğısız günləri:
Elə billəm həyata

Yenidən doğuluram;
Məni qoynuna alıb,
Xəyallar hey yol gedir...
Danışıram xəyalla,
Soruşub, cavab allam.
Atıb kədəri, qəmi,
O xoş günlərlə qallam...
Silirəm göz yaşımı,
Danışıram, gülürəm,
Xəyalınla yaşayıb,
Xəyalınla ölürəm!

...Kaş sızlayan yarana
Məlhəm ola biləydim.
Səni yağı əlindən
Bircə ala biləydim...
Rahat olaydım, vətən!..
Ondan sonra öləydim,
Qarışıb torpağına,
Torpaq olaydım, vətən,
Qarışıb torpağına,
Torpaq olaydım, vətən!!!

## BİR QƏRİB AĞLAYIR...

Dərdi bu dünyanın özündən ağır,
Üzündən-gözündən qüssə, qəm yağır.
İllərdi həsrətlə yollara baxır,
Bir qərib ağlayır burda vətənsiz!

İşləri düzəlib yatmaz biçimə,
Bilmir el-obasız necə keçinə.
Baxıb köks ötürür durna köçünə,
Bir qərib ağlayır burda vətənsiz!

Fikrini başına yığa da bilmir,
Dolub bulud kimi, yağa da bilmir.
Əl atıb, düşməni boğa da bilmir...
Bir qərib ağlayır burda vətənsiz!

Kədəri bəllidir halından belə,
Xoşlamaz car çəkib, gətirsin dilə.
Yaralı qartaltək çırpınır elə,
Bir qərib ağlayır burda vətənsiz!

Günbəgün doğranır səbrinin üstə,
Şər gəlir zülmünün, cəbrinin üstə.
Ölsə, "nakam" yazın qəbrinin üstə,
Bir qərib ağlayır burda vətənsiz!

Üzülüb möhnətdən, bezib inləyir,
Əl açıb, Allahdan imdad istəyir:
Namiqi Laçına qovuşdur, – deyir,
Bir qərib ağlayır burda vətənsiz!..

## ÖLDÜRÜR

Dövranın nə boyda dərdi-səri var:
Kölgədə qalıbdı qeyrət, namus, ar.
Nadanın əlinə keçib ixtiyar,
Əkir bağ-bağçanı, – çiçək öldürür.

Hamı gileylidir əzəldən bəri, –
Həyatda çoxunun səhv düşür yeri.
Kimini savaşda düşmən əsgəri,
Kimini bir üzügöyçək öldürür.

Get-gedə tükənir dünyanın mərdi,
Namiq, səbir eləmək böyük hünərdi...
Kimisə bir qarın yeməyin dərdi,
Məni anladığım gerçək öldürür!

## MƏNİMLƏ HƏMSÖHBƏT OLANLARA

Siz Allah, qoymayın üz tutsun yaram,
Ağlayın, sızlayın yanımda mənim.
Laçın dağlarıdır təbibim, çaram, –
"Laçın yarası" var canımda mənim!

Onsuz da əzəldən yaralıyıq biz;
Zəngəzur yaralı, Göyçə yaralı...
Soruşan olsa ki, haralıyıq biz,
Bəs nə cavab verək, deyək haralı?!

Necə söyləyək ki, vətənsizik biz,
Vətəni yağıya satıb gəlmişik!
Necə söyləyək ki, kəfənsizik biz,
Kəfəni səngərdə atıb gəlmişik!

Biz nələr çəkirik, Allah da bilmir,
Yolunu azmışlar azdırıb bizi!
Üzümüz gülsə də, qəlbimiz gülmür,
Bu saxta yaşayış bezdirib bizi.

Qaçqın həyatını duymayan kəslər
"Bəxtəvər qaçqınlar" deyirlər, bizə.
Qaçqını insan da saymayan kəslər
Şübhəsiz, arxada söyürlər bizə!

Gündüz gördüyümüz zillətdən betər,
Yorğan üstümüzə yatmır, gecələr.
Yenə dadımıza ümidlər yetər...
Naləmiz kimsəyə çatmır, gecələr!

Gündüzü, gecəsi zindan həyatı –
Qaçqının taleyi belə yazılıb...
Nə başa düşür ki, nadan, həyatı,
Nə bilir daşqına, selə yazılıb?!.

## OLMASA

Alovludur hələ sinəm,
Açılmayan bir tilsiməm.
Kim bilər ki, axı, kiməm,
Öz elim, obam olmasa.

Nadanlar "səyirdir atı",
Qalmayıb ömrün urvatı.
Yaşamazdım bu həyatı,
"Söz" kimi odam olmasa.

Daşlar dil açıb dinəcək,
Mələklər göydən enəcək,
Dünyanın çarxı dönəcək,
Adamlar adam olmasa.

## SIXINTI

Yer üzünə nə verdi ki, gəlişi,
Başdan-başa xəyanətdir hər işi:
İnsanların bu dünyaya "bəxşişi" –
Tələfatdı, dağıntıdı, dağıntı.

Haqq yolunda boğulubdu neçə səs...
Əqidələr, sözlər qalıb – müqəddəs.
Bu cəhalət, qarayaxma, kəshakəs,
Keçmişlərdən yığıntıdı, yığıntı.

Namiq, sənə ögey oldu bu həyat,
Umacağı düşüncəndən qopar, at!
...Şairlərin gecələri narahat,
Gündüzləri sıxıntıdı, sıxıntı!..

**ŞƏHİDLƏRİMİZ**

## SÖZÜNÜ DÖYÜŞ MEYDANINDA DEDİ...

**“Hər bir şəhid bizim üçün böyük itkidir. Onların xatirəsi bizim üçün əzizdir, qəlbimizdə daim yaşayacaqdır”.**

**Heydər ƏLİYEV,**
***Azərbaycan xalqının ümummilli lideri***



Vətənimizin igid oğullarından biri də Daxili Qoşunların sıravi hərbi qulluqçusu, şəhid Əzizağa Mirzəağa oğlu Əsədovdur.

Sıravi Əzizağa Əsədov 1973-cü il dekabrın 23-də Qazıməmməd şəhərində (indiki Hacıqabul – A.Ə) dünyaya göz açıb. Hacıqabul şəhərindəki 1 saylı orta məktəbdə təhsil alıb. Əzizağanın təhsil aldığı yeniyetməlik çağı respublikamızın ən ağır, təlatümlü dövrlərinə təsadüf edir.

Əzəli Azərbaycan torpaqları hesabına “Ermənistan Respublikası” yaradan daşnaklar, soydaşlarımızı dədə-baba yurdlarından qovur, qətliamlar törədir, illərlə topladıqları, əzab-əziyyətlə qurub yaratdıqları ev-eşiklərini, maddi vəsaitlərini mənimsəyirdilər. Bütün bunlar azmış kimi, indi də xaricdəki havadarlarının köməyi ilə Qarabağda və digər sərhədyanı bölgələrdə yaşayan soydaşlarımızı güllələbaran edir, evlərini və təsərrüfatlarını yandırır, girov götürür, terror hadisələri törədirdilər.

Bütün bu kimi “qara” xəbərləri yuxarı sinif şagirdi olan Əzizağa artıq hər gün eşidirdi. “Ermənilərin vəhşiliyinə görəsən haçan son qoyulacaq?”– kimi sualı öz-özünə tez-tez verərdi. Bu sualın cavabını isə özü də cavablandırardı: “düşmənə layiq olduğu cavabı verməklə!.. təcavüzkar ermənilərin burnunu ovmaqla!”.

Bu fikirlərlə Əzizağa düşməndən qisas alacağı günü səbirsizliklə gözləyirdi...

Orta təhsilini başa vuran Əzizağa indi abituriyent kimi ali məktəbə yox, çağırışçı kimi hərbi xidmətə getməyə hazırlaşırdı. 1992-ci ildə 18 yaşı tamam olan kimi, Əzizağa Əli-Bayramlı (indiki Şirvan) RHK tərəfindən hərbi xidmətə çağırılır. Beləliklə də o, Daxili Qoşunların sıravi hərbi qulluq-

çusu kimi Vətən qarşısında olan müqəddəs borcunu şərəflə yerinə yetirməyə başlayır.

Nizam-intizamı və bacarığı ilə qısa müddətdə kollektivin hörmətini qazanan Əzizağa, hərbi biliklərə xüsusi maraq göstərərdi. O bilirdi ki, təcavüzkar düşmənə qarşı döyüşlərdə bu biliklər əsgərlərimizə hava və su kimi lazımdır. Ona görə də, təlimlərdə fəal iştirak edirdi.

Bir qədər sonra Əzizağa düşmənlə təmas xəttində yerləşən Daxili Qoşunların N saylı hərbi hissəsinə, qanlı döyüşlərin getdiyi və respublikamızın dilbər guşələrindən biri olan Laçın rayonuna ezam olunur. Cəsur silahdaşımız fikirlərində heç də yanılmamışdı. Qazandığı hərbi biliklər indi onun işinə yarayırdı. Sərrast atəşi ilə neçə-neçə düşmən əsgərini cəhənnəmə vasil etmişdi. Necə deyərlər, ona rahatlıq verməyən sualların cavabını döyüş meydanlarında praktiki olaraq məharətlə yerinə yetirirdi.

Vətənin qeyrətli oğlunun həyat və döyüş yolundan bəhs edən qısa yazıya Hacıqabul Rayon Mərkəzləşdirilmiş Kitabxana Sisteminin www.haciqabul-mks.az internet saytının "Hacıqabul şəhidləri" bölümündə də rast gəlmək olar. Saytda Əzizağanın 1992-ci ildə ordu sıralarına getdiyi və ilk döyüş yolunun Laçın rayonunun müdafiəsindən başladığı qeyd olunub. Həmçinin şəhidin 19 yaşının səngərdə tamam olduğu və onun gizlin dəstəsinin əsasən Təzəkənd postunda keşik çəkdiyi göstərilib.

**28.01.1993-cü il.** Əzizağanın ömrünə son gün kimi yazıldı. Həmin günkü döyüşdə Əzizağa ağır yaralanaraq, gözlərini əbədi yumdu... Bəxtinə yazılan ömür payının 19-cu ilində, 20-ci qışında igid döyüşçü hər kəsə nəsib olmayan yüksəlişə – şəhidlik zirvəsinə ucaldı.

Sıravi Əzizağa Əsədov Hacıqabul şəhərindəki Şəhidlər xiyabanında dəfn olunub.

**Allah şəhidlərimizə rəhmət eləsin!**

**Anar ƏHMƏDOV,**
**Daxili Qoşunların zabiti, kapitan**

**İLK SINAQ**



**Fidan MƏMMƏDOVA,**
***Laçın rayonunun Bozdağan kəndi,***
***XI sinif şagirdi***

## ANA

Baş əyər sənə yerlər həm göylər,
Mən sənə baş əysəm bəs eləyərmi?
Yoluna sərilər çiçəklər, güllər,
Yoluna sərilsəm bəs eləyərmi?

Cavanlığın mənim uşaqlığımdı,
Dönüb uşaq olsam bəs eləyərmi?
Gördüyüm hər röya laylalarındı,
Bir layla söyləsəm bəs eləyərmi?

Əlimdən tutmusan hər addımımda,
Əllərindən öpsəm bəs eləyərmi?
Mənə sərf etdiyin gənclik uğrunda
Bir ömrü bəxş etsəm bəs eləyərmi?

## HƏYAT, MƏNDƏN DAHA NƏ İSTƏYİRSƏN

Ağlaya bilmirəm, ürəyim yanır,
Gözümün yaşını qurutmusan sən.
Yaşasamda nəfəs ala bilmirəm
Həyat, məndən daha nə istəyirsən?!

Hər qəhqəhəm bir acımı gizlədir,
Gülüşüm yalandır, sən də bilirsən.
Gülsəm də gözlərim hər şeyi deyir,
Həyat, məndən daha nə istəyirsən?!

Yoruldum, artıq dözə bilmirəm,
Mənlə oynamaqdan heç bezməmisən?
Mənsə səni yaşamaqdan bezmişəm,
Həyat, məndən daha nə istəyirsən?!

Sevirəm demişdim nifrət etdirdin,
De görüm bunu necə edirsən?
Arxamdakıları qarşıma çəkdin,
Həyat, məndən daha nə istəyirsən?!

Çəkdiklərim sənə bəs eləməyib?
Daha çox inciməyimi istəyirsən?
Amma məndə o ürək artıq bitib,
Həyat, məndən daha nə istəyirsən?!

Mən yıxıldıqca daha çox bitirəm,
Sən mənim hər çöküşümə gülürsən.
Artıq bir cavab ver sənə deyirəm!
Həyat, məndən daha nə istəyirsən?!

Ən şirin candı onu da istəmirəm,
Ruhum ölüb, cismim donub görmürsən?!
Nəyi gözləyirsən artıq bilmirəm...
Al canımı, daha nə istəyirsən?!

**UNUTMA!**

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




**"Bəxtiyar-4"** mətbəəsinin direktoru: **Bəxtiyar İSMAYILOV**
Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Firuzə NƏSİBLİ**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **02.07.2015**
Çapa imzalanmışdır: **10.10.2015**
Şərti çap vərəqi: **6.** Sifariş **№17**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **1000.** Qiyməti: **2 AZN**

Dərgi **"Bəxtiyar-4"** istehsal-kommersiya firmasında
hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** baxtiyar54@rambler.ru
**Tel:** (+99412) 568-44-53, (+99450) 570-63-54
**Ünvan:** Bakı, Mir Cəlal 83